BAKI DÖVLƏT UNİVERSİTETİ ŞƏRQŞÜNASLIQ FAKÜLTƏSİ

Mənzərə Həsən qızı
Məmmədova

# NİZAMİ GƏNCƏVİ DİLİNİN LÜĞƏTİ

I hissə

ا—ذ

Bakı - 2009

7457

Azərbaycan Respublikası Prezidentinin
İşlər İdarəsi
PREZİDENT KİTABXANASI

*Bakı Dövlət Universiteti Şərqşünaslıq fakültəsi Elmi şurasının 25 oktyabr 2008-ci il tarixli 02 saylı iclasının qərarı ilə nəşrə məsləhət görülmüşdür.*

*Redaktorları:* filologiya elmləri doktoru, professor **Mirzə Rəhimov**

filologiya elmləri doktoru, professor **Mehdi Kazımov**

*Rəyçilər:* filologiya elmləri namizədi, dosent **Əsmətxanım Məmmədova**

filologiya elmləri namizədi, dosent **Tofiq Cahangirov**

**Məmmədova M.H.** Nizami Gəncəvi dilinin lüğəti, I hissə, («Şərəfnamə» əsəri üzrə), "Nafta-Press" nəşriyyatı, Bakı – 2009

ISBN 978-9952-437-38-6

Oxuculara təqdim olunan bu əsərdə Nizami Gəncəvinin «Şərəfnamə» poemasının leksik tərkibinin lüğətini yazmaq məqsədi qarşıya qoyulmuş və məsnəvidəki sözlər, müxtəlif sözbirləşmələri, frazeoloji ifadələr, məcazlar, bədii obrazlar və s. dil vahidlərinin mənalarının müqabili azərbaycanca verilmişdir.

Lüğətin hazırlanması əsasən iki mərhələdən ibarət olmuşdur. Birinci mərhələdə «Şərəfnamə» əsərinin dil vahidlərinin tezlik sözlüyü fars əlifbasına uyğun tərtib olunmuş, ikinci onların azərbaycanca mənaları müəyyənləşdirilmişdir.

Növünə görə «Farsca-azərbaycanca» olan bu ikidilli lüğət Nizami Gəncəvi əsərlərinin dil və üslub məsələləri ilə məşğul olan mütəxəssislər, şairin irsini öyrənən mətnşünaslar, klassik və müasir fars dili tədqiqatçıları, tələbələr, habelə geniş oxucu kütləsi üçün əvəzsiz mənbədir.

$M\frac{4603020000-1}{071-2009}$ Qrifli nəşr

© Mənzərə Məmmədova, 2009

## Nizami Gəncəvinin «Şərəfnamə» əsərinin lüğətinin tərtib prinsipləri

Hər hansı bir müəllifin əsərlərinin və ya bir əsərinin lüğətini tərtib etmək üçün leksikoqrafın əlində həmin əsərin elmi- tənqidi mətni olmalıdır. Bu baxımdan Nizami Gəncəvinin əsərlərinin lüğətini hazırlamaq üçün demək olar ki, lazımı dərəcədə olan elmi-tənqidi mətnlər mövcuddur. Onlar müxtəlif illərdə, müxtəlif mütəxəssislər tərəfindən hazırlanmış və nəşr olunmuşdur. Bunlar içərisində şairin «İskəndərnamə», o cümlədən əsərin birinci hissəsi «Şərəfnamə»nin bu növ nəşri mövcuddur və o, Azərbaycanın görkəmli alimi akademik Əbdülkərim Əlizadə tərəfindən yüksək səviyyədə hazırlanmış, 1947-ci ildə Bakıda çap olunmuşdur. Əsərin bir çox məziyyətlərə malik olması, həmçinin onun əsasında əsərin lüğətinin hazırlanması işində tam dəyərli və faydalılığı haqqında səlahiyyətli alimlərin müsbət fikirləri mövcuddur. Onlardan birinə nəzər yetirək:

«...Nizami əsərlərinin əslini, bütün təfsilatı ilə bu mətnin əks etdirdiyini iddia etmək olmaz. Bu, ümumiyyətlə mümkün olan bir şeydir, lakin gələcəyin işidir. Bu mətn, tarixi prinsipi tətbiq etməklə, işi davam etdirməyə imkan verəcəkdir. Bunun əsasında Nizami əsərlərinin tam lüğəti tərtib edilə bilər, daha sonra onun dilinin xüsusiyyətləri aydınlaşar. Gələcək tədqiqat nəticəsində Nizami əsərlərinin əslinə yaxın mətnini müəyyən etmək mümkün olar. »

Əsərin redaktoru, akademik E.Bertelsin «Şərəfnamə»nin elmi-tənqidi mətninə yazdığı müqəddimədən götürülmüş bü sətirlərə əsaslanaraq bir daha göstərmək olar ki, Nizaminin əsərlərinin lüğətinin hazırlanması, şairin hələ də elmi nəzərdən kənarda qalan dilinin leksik-qrammatik tədqiqi və onun əsərlərinin orijinal mətninin bərpası baxımından nə qədər böyük əhəmiyyət kəsb edir.

Yuxarıdakı müddəalar əsas götürülərək oxuculara təqdim olunan lüğətin hazırlanması əsasən iki mərhələdən ibarət olmuşdur. Birinci mərhələdə Nizaminin «Şərəfnamə» əsərinin dil vahidlərinin sözlüyü, onun ilk beytindən sonuncusunadək müəyyənləşdirilmiş, söz vərəqləri fars əlifbasına uyğun sıralanmış, tezliyi göstərilmişdir. Bu söz vərəqlərinin sayı sonsuz dərəcədə çoxdur, onun kartotekası lüğətin ikinci mərhələsi üçün baza rolunu oynayır. İkinci mərhələdə həmin dil vahidlərinin mənası verilmişdir ki, onlar da Nizaminin işlətdiyi mənalardır. Nizami Gəncəvinin leksik üslubuna əsaslanan bu mənalar şairin bədii dilinin, bədii təxəyyülünün, söz sənətkarlığının əksi kimi çox maraqlıdır

və onların təsdiqi üçün leksikoqrafa şairin əsərindən gətirilmiş beytlərindən başqa heç nə kömək edə bilməz.

Əlbəttə, lüğətin tərtibində şairin dil vahidlərinin düzgün müəyyənləşdirilməsinin də əsaslı əhəmiyyəti vardır. Onlar lüğətin söz maddələrinə əsasən belə qruplaşırlar:

1. Hərf və səslər (fars əlifbasının 32 hərfi və həmzə)
2. Sözdüzəldici və söz dəyişdirici morfemlər
3. Bağlayıcılar və cümlənin qeyri- müstəqil üzvləri
4. Nitq hissələri( əsas və köməkçi nitq hissələri)
5. Modal sözlər
6. Təqlidi sözlər
7. Söz tərkibləri (təyini söz birləşmələri (izafət və yanaşma), müxtəlif növ tərkiblər)
8. Frazeoloji ifadələr
9. Poetik ifadələr

Göründüyü kimi dil vahidləri baxımından Nizami Gəncəvinin əsərlərinin dili ilə fars dilinin arasında fərq nəzərə çarpmır, yəni, yuxarıdakı dil vahidləri fars dilindəkilərin eynidir və onların bölgüsündə leksik üslubiyyatdan başqa bir fərq yoxdur. Bunun səbəbi isə ondan ibarətdir ki, hər hansı bir bədii əsər yazıldığı dilin dil vahidlərinə əsasən meydana gəlir. O dil vahidləri ki, əsrlər boyu öz xüsusiyyətlərini qoruyub saxlayır və qrammatik qaydalara əsaslanır. Odur ki, lüğətdə Nizami Gəncəvi əsərlərinin dil vahidləri yalnız fars dilinin leksik vahidlərinin bölgülərinə müvafiq müəyyənləşdirilmişdir.

İndi bu dil vahidlərinin lüğətdə yerləşdirilməsinin xüsusiyyətlərinə nəzər yetirək:

1. «Şərəfnamə» əsərinin ilk beyti «خ»-xe hərfi ilə başlanan «خدا »-xoda sözündən ibarətdir. Odur ki, lüğətin kartotekasının dil vahidlərini tərtib edərkən həmin sözə iki söz maddəsi yazılmışdır. Birinci, sözün baş hərfinə, ikinci sözün özünə. Birinci lüğət maddəsi dil vahidi kimi hərf olduğundan lüğətin birinci qrup dil vahidlərinə, ikinci lüğət maddəsi isim olduğu üçün lüğətin yuxarıda göstərilən dördüncü qrup dil vahidlərinə aiddir. Burada yalnız birinci qrup dil vahidlərindən söhbət etdiyimiz üçün, əsərin birinci beytinin lüğət maddələrinə diqqət edək:

خدایاجهان پادشاهی تراست          زماخدمت آیدخدائی تراست(۳, ۱)

İlahi, dünyaşahlığı sənindir, biz qulluqçuyuq, hökmranlıq sənindir.

ی (y) - iki sait arasında işlənən bitişdirici samitdir.



ا (a) - xitab bildirir.

ء (həmzə) - iki sait arasında bitişdirici samit əvəzinə işlənir.

ی (i) - Fars dilində یای مصدر (ya-ye məsdər) adlanır. Müxtəlif sözlərə qoşularaq mücərrəd mənalı isimlər əmələ gətirir.

ت (to) - تو (to) şəxs əvəzliyinin qısa formasıdır.

ز (ze) - از (əz) önqoşmasının qısa formasıdır, çıxışlıq halı bildirir.

آ (a) - آمدن (amədən) felinin köküdür.

د (əd) - Felin bəzi şəkillərində, 3-cü şəxsin təkində işlənən şəxs sonluğudur.

Göstərilən lüğət maddələrinin hər birindən sonra beyt verilir, səhifə və beytin nömrəsi göstərilir, münasib hərflərin dil vahidlərinin içərisində əlifba sırasına görə yerləşdirilir.

Beləliklə, lüğətin birinci növ dil vahidlərinə aşağıdakı lüğət maddələri daxil edilmişdir:

1. Fars əlifbasının 32 hərfi və həmzə

a. Müxtəlif səbəblər əsasında qısa formada işlənən sözlər, ön qoşmalar. Məs.: ت(تو)، ز(از)،ب(به، با)،ک(که)

b. İki sait arasında işlənən bitişdirici samitlər. Məs.: ی، گ، و

c. Müxtəlif qrammatik funksiyalı əliflər. Məs.: ا(الف خبری) (əlef-e xəbəri) - ismi xəbərdə işlənən xəbər şəkilçisi, ا(الف خطاب) (əlef-e xetab) - xitab bildirən əlif, ا(الف آرزو) -arzu bildirən əlif.

ç. Bir hərfdən ibarət sözdüzəldici şəkilçilər. Məs.: ی(یای مصدری) (ya-ye məsdəri) - mücərrəd mənalı isim əmələ gətirən sözdüzəldici şəkilçi, ی ( یای نسبت) (ya-ye nesbət) - nisbi sifət şəkilçisi, ش (ش مصدری) (şin-e məsdəri) - feli isim əmələ gətirən sözdüzəldici şəkilçi, ک (ک تصغیر) (kaf-e təsğir) - kiçiltmə bildirən sözdüzəldici şəkilçi, ه(های مفعول) (ha-ye məf'ul) - keçmiş zaman feli sifəti əmələ gətirən sözdüzəldici şəkilçi, ی(یای لیاقت) (ya-ye ləyaqət) - feli isim və gələcək zaman feli sifəti əmələ gətirən sözdüzəldici şəkilçi, آ(الف فاعلی) (əlef-e fa'eli) - indiki zaman feli sifəti əmələ gətirən sözdüzəldici şəkilçi.

d. Bir hərfdən ibarət söz dəyişdirici şəkilçilər. Məs.:

1. ی(یای نکره) (ya-ye nəkəre) - qeyri-müəyyənlik bildirən «ı».
2. ی(یای وحدت) (ya-ye vəhdət) - vahidlik bildirir.
3. ی(یای استمراری) -estemrari zaman formasını əmələ gətirir.
4. ضمایر متصلهء نسبی(م،ت،ش) (zəmayer-e mottəsele-ye nesbi) - nisbət şəkilçiləri.
5. ضمایرمتصلهء مفعولی(م،ت،ش) (zəmayer-e mottəsele-ye məf 'uli) - tamamlığın növlərini əvəz edən bitişik əvəzliklər.

6. (ام، ای، اش)ضمایر متصلهء خبری (zəmayer-e mottəsele-ye xəbəri) - xəbər şəkilçiləri.

Lügətdə o da unudulmamışdır ki, klassik fars dilində «həmzə» qeyri-müəyyənlik kateqoriyasının göstəricisi kimi də işlənir. Nizami dilində «həmzə»nin bu funksiyası da özünü göstərir. Odur ki, lügətdə belə bir söz maddəsinə təsadüf etmək olur:

ء (həmze) - qeyri-müəyyənlik kateqoriyasının göstəricisi kimi işlənir. Məs.:

پراکنده از هردری دانهء    برآراستم چون صنم خانهء (۵۴, ۱۲)

Hər yerə səpələnmiş əhvalatları sənəmxana(bütxana) kimi bəzədim

2. Bu növ dil vahidlərinə iki və ikidən çox hərfdən ibarət morfemlər daxildir. O cümlədən:

a. Sözdüzəldici şəkilçilər:مند (mənd), کار (kar), گار (qar), وار (var), سار (sar), آسا (asa), آنه (ane), انده (ənde), آن (an), گاه (qah), لاک (lak), ناک (nak), این (in), اینه (ine), گان (qan), گر (gər)

b. Sözdəyişdirici şəkilçilər, son və önqoşmalar:

1. Cəm şəkilçiləri: آن (an), ها (ha)
2. Şəxs sonluqları: ام (əm), ای (i), اد (əd), ایم (im), اید (id), اند (ənd), است (əst)
3. Nisbət şəkilçiləri: مان.(e-man), تان.(e-tan), شان.(e-şan).
4. İnkarlıq bildirən önşəkilçilər: نه (nə), مه (mə)
5. Sıra bildirən şəkilçilər: ام (om), امین (omin), این (in)
6. Önqoşmalar: از (əz), به (be), با (ba), تا (ta), در (dər)
7. Sonqoşma: را (ra)
8. Felin zaman formalarında işlənən ədatlar: می (mi), همی (həmi)

Lügətdə daha geniş və əhatəli şəkildə əks olunan bu qəbil dil vahidlərinin lügət maddələrində onların qrammatik funksiyaları göstərilir. Məs.:

است (əst) - 111 ş. t. xəbər şəkilçisi.

خدایا جهان پادشانی تراست    زما خدمت آیدخدائی تراست(۳, ۱)

3. Bağlayıcı və cümlənin qeyri- müstəqil üzvləri. Məlum olduğu kimi tabeli və tabesiz bağlayıcıların hər bir qrupu münasib mürəkkəb cümlələrin tərkib hissədəri arasında müxtəlif qrammatik münasibətlər və mənaların tələbilə işlənir və həmcins üzləri biri digərinə bağlayırlar. Həmin bağlayıcılara aşağıdakılar misaldır:

و (və), گاه... گاه (qah-qah)), هم...هم (həm-həm), یا...یا (ya-ya), اگر (əgər), باآنکه (ba-an-ke), بااینکه (ba-in-ke), هرچند (hər-cənd), هرچندکه (hər-cənd-ke), اگرچه (əgər-çe), جائیکه (cai-ke), وقتیکه (vəqti-ke), هنگامیکه (henqami-ke), زمانیکه (zəmani-ke), آنکه (an-ke), اینکه (inke), که (ke), چو



(ço), چونکه (çon-ke), زیرا (zira), زیرا که (zira-ke), برای اینکه)bəra-ye in-ke), برای آنکه (bəra-ye an-ke), ازینکه (əz-in-ke), ازآنکه (əz-an-ke), ولی (vəli), اما (əmma), تا (ta) və s.

Göstərilən və göstərilməyən bağlayıcıların bir qrupu müxtəlif mənalarda işləndiyi üçün onların bu xüsusiyyətləri nəzərdə tutulmuş, onların hər birini əks etdirən ayrıca lügət maddəsi ayrılmışdır. Bu xüsusiyyət özünü daha çox که (ke) bağlayıcısı ilə əlaqədar göstərir.

Qeyd etmək lazımdır ki, bağlayıcı və qeyri-müstəqil üzvlər biri-digərinə oxşasalar da, cümlədə işlənmə xüsusiyyəti və funksiyasına görə təmamilə fərqlidirlər. Fikrimizi aydınlaşdırmaq üçün aşağıdakı beytlərə müraciət edək:

درسخن پنهان شدم چون بوی گل دربرگ گل    میل دیدن هرکه دارد درسخن بیند مرا
(حکیم حاذق)

Gül ləçəyində (gizlənən) gül ətri kimi sözdə gizləndim
Məni görmək istəyən sözdə görər məni (Həkim Hazeğ)

Və yaxud:

گرتقویت ملک کنی ملک بری    ورتونکنی هرکه کنداوببرد(سعدی)

Ölkəni qüvvətləndirsən, onun sahibi olarsan, sən etməsən, edən ona sahib olar.

Həkim Haziq və Sədi şerindən gətirilən bu beytlərdə هرکه (hər ke) ilk baxışda bağlayıcını xatırladır, halbuki, o cümlənin qeyri-müstəqil üzvüdür. Çünki, هر (hər) - i izah edənمیل دیدن مرادارد (meyl-e didən-e məra darəd) - « məni görmək istəyir» cümləsini که (ke) ilə birlikdə ixtisar etsək, dil normaları pozular, məna alınmaz.

Həmçinin ikinci misalda هر (hər) - i izah edən کند (konəd) cümləsini که (ke) ilə ixtisar etsək, yuxarıdakı kimi, dil normaları pozular. İndi beytlərdəki izahedici cümlələrsiz yaranan anlaşılmazlığa nəzər salaq:

درسخن پنهان شدم چون بوی گل دربرگ گل ...هر...درسخن بیندمرا
گرتقویت ملک کنی ملک بری    ورتونکنی هر...اوببرد

Belə hallar təyin budaq cümlə və izahedici cümlə işlənən tabeli mürəkkəb cümlələrdə baş verir. Bu cümlələrdə təyin budaq cümlələrlə əlaqədar işlənən bağlayıcılar müstəqil, izahedici cümlələrlə işlənənlər qeyri-müstəqil üzv adlanır.

Professor Ə. Şəfainin deyilənlərlə əlaqədar söylədiyi fikirlərə diqqət edək: ...baş cümlədəki bir üzvün qeyri-müstəqil üzv olub-olmamasını təyin etmək üçün aşağıdakılara əməl olunur: İzahedici cümləni که (ke) bağlayıcısı və (یای اشاره)ی (ya-ye eşare) ilə birlikdə ixtisar edirik. Yerdə qalan sadə cümlədə dil normaları pozulsa, məna ciddi şəkildə təhrif edilsə, belə nəticəyə gəlmək lazımdır ki, ixtisar olunan cümlə təyin budaq cümləsi olmayıb,

izah olunan üzvün məzmununu açan cümlə olmuşdur. Nəticədə isə məlum olur ki, izah olunan üzv qeyri-müstəqil üzv olmuşdur. Yerdə qalan cümlədə dil normaları pozulmasa, məna ciddi şəkildə təhrif olunmasa, belə nəticəyə gəlmək lazımdır ki, ixtisar olunan budaq cümlə, təyin budaq cümlə olub, baş cümlədə isə qeyri-müstəqil üzv olmamışdır. »

İndi bəzi qeyri-müstəqil üzvlərə nəzər yetirək:

آين (in), هر (hər), آن (an), همان (həman), همين (həmin), چنان (çenan), چنين (çenin), هركه (hər ke), هرچه (hər çe), هر كس كه (hər kəs ke), هرچيز كه (hər çiz ke), هرقدركه (hər qədr ke), هرآن كه (hər an ke), هرآنچه (hər an çe), هروقت (hər vəqt), هرطور (hər tour), هرجور (hər cur), هرگونه (hər qune), هرآن چيز (hər an çiz), هركس (hər kəs), هرآن كس كه (hər an kəs ke), هرگاه كه (hər qah ke), هرزمان كه (hər zəman ke), هرآنگاه (hər an qah), هرچند (hər çənd), هر اندازه (hər əndaze), باآنكه (ba an ke), باوجود آنكه (ba vocud-e anke), هرجا (hər ca), هرآنجا كه (hər anca ke), هركجا (hər koca), آنچه (ançe) və s.

Qeyd etmək lazımdır ki, göstərilən qeyri-müstəqil üzvlərin bəziləri həm də müstəqil üzv kimi işlənirlər. Məsələn, هر جا (hər ca) cümlədə hər iki xüsusiyyətə malikdir. Aşağıdakı misallara nəzər yetirək:

مهری برای ردگم کردن وبرای اینکه ازهرجاسردربیاوردچندروزی هم بدانشکدهءادبیات رفته بود (مجلهء سخن)

Mehri izi itirmək və hər yandan xəbər tutmaq üçün bir neçə günlüyə ədəbiyyat fakültəsinə də getmişdi.

بهرجاكه اوآتشی دیدچست        هم آتش فروكشت وهم زندشست(۲۱۰, ۶۱)

Yuxarıdakıki misalda هرجا (hər ca) - nın həm leksik mənası, həm də qrammatik funksiyası fərqlidir. Yəni, birinci misalda «hər yer» mənasında işlənərək, cümlənin tamamlığıdır, ikinci misalda qeyri-müstəqil üzvdür. Nizaminin həmin beytinin tərcüməsi belədir: Yanar ataş gördüyü yerdə həm odu söndürür, həm Zəndi silirdi (yer üzündən).

Onu da qeyd etmək lazımdır ki, yuxarıda göstərilən xüsusiyyətlərinə görə, formaca eyni olsalar da, bağlayıcılara başqa, cümlənin qeyri-müstəqil üzvlərinə başqa kartoçka yazılmışdır. O da məlumdur ki, yüxarıdakı sözlər əvəzlik kimi də işlənə bilər. Əlbəttə, kartoçka yazanda bu xüsusiyyət də nəzərdən qaçırılmamışdır. Məs.:

تونی آنكه تامن منم با منی        وزین درمبادم تهی دامنی(۸, ۶۶)

Nə qədər ki yaşayıram mənimlə olan sənsən

Bu qapıdan ümidsiz olmayım

زغیب آن نمودارش آری بدست        كزین غایب آگاه باشدكه هست(۷, ۶۶)

Qeybdən o aşkarlığı əldə edərsən ki, bu qayibin varlığından xəbərdar olarsan.



Hər iki beytdə آن (an), müxtəlif məna və qrammatik funksiyaya malikdir. Birincidə cümlənin qeyri- müəyyən üzvü, ikincidə müstəqildir.

Məlum olduğu kimi, yuxarıda göstərilən dil vahidləri, bədii əsərlərdə, o cümlədən şeirdə də müxtəlif şəkildə işlədilmişdir. Bəzi fonetik səbəblərə, o cümlədən poetik normalara məruz qalmış bu fonetik variantlı sözlər Nizami Gəncəvi əsərlərində də geniş yer tapmışdır. Başqa sözlə desək, belə fonetik sinonimlərə lüğətdə ayrıca yer verilmişdir ki, onlara aşağıdakılar nümunə ola bilərlər:

هركه – هرک (hər ke- hərk), هرچه – هرچ(hərçe- hərç), هرآنكه –هرآنک (hər an ke- hərank), هرآنچه –هرآنچ(hər an çe- hərançq), هرگاه – هرگه (hər qah-hər gəh)

هرآنچ آفریداوباسباب نیست        بدریافتن عقل راتاب نیست(۱۶۰, ۱۰)

O yaratdıqlarının heç birinin əsası yoxdur (heç nədəndir)

Ağlın dərk etməyə gücü yoxdur.

4. Lüğətin sözlüyünün böyük və əsas hissəsini nitq hissələri təşkil edir ki, onlara ayrı-ayrılıqda nəzər salaq:

A. İSİMLƏR. Bu nitq hissəsi ümumi, xüsusi və mücərrəd isimlərə ayrılaraq geniş sahələrə aiddir və hər birinin özünə məxsus xüsusiyyətləri vardır. Hər bir ismin lüğət maddəsi adlıq halında, təkdə verilir, qalan qrammatik kateqoriyalarının göstəriciləri, yəni, konkret isimlə işlənmiş cəm şəkilçiləri, onun hal münasibətlərinin göstəricisi olan vasitələr (morfoloji və leksik), qeyri-müəyyənliyin qrammatik göstəricisi başqa-başqa lüğət maddələri kimi verilir. Məs.:

درختان شكفتند برطرف باغ        برافروخته هرگلی چون چراغ(۶۱, ۱۷)

Bağda ağaclar çiçəkləndi

Hər bir gül çırağ kimi parladı

Bu beytdəki «درختان » - ağaclar sözü tək halda bir lüğət maddəsində, آن (an) cəm şəkilçisi ayrı lüğət maddəsində verilir, ikinci sətrdəki گلی (qoli), qeyri- müəyyənlik bildirdiyi üçün, iki yerə parçalanaraq müxtəlif söz maddələrində yerləşdirilir. Bunlardan biri «gül» sözünə, ikincisi, «ya-ye nəkərə» yə aid edilir. Bu beytdə «باغ» və «چراغ» da lüğətdə isim kimi öz yerlərini tapmışlar.

Başqa beytdə ismin hal kateqoriyasının göstəricilərinə nəzər yetirək:

بمرغ زبان بسته آواز ده        كه پروازپارینه رابازده(۶۱, ۱۸)

Susmuş quşu səslə ki, əvvəlki uçuşuna başlasın

Burada به (be) önqoşması yönlük halın göstəricisi kimi مرغ (morğ) sözündən ayrılmış, ayrıca söz maddəsində yazılmışdır.

«Şərəfnamə»dən isimlər seçilərkən onların struktur xüsusiyyətləri nəzərdən qaçırılmamışdır. Bu xüsusiyyətlər düzəltmə və mürəkkəb isim-

lərə aiddir. Düzəltmə isimlərdən danışarkən, qeyd edilməlidir ki, mücərrəd mənalı isimlər bu qəbildən olduğundan, lüğətdə onların hər birinə iki lüğət maddəsi yazılmışdır. Birincisi mücərrəd mənanı bildirən ismə, ikincisi həmin dil vahidini yaradan ی (ya-ye məsdəri)yə. Məsələn:

سرنسترین رازموی سپید    سیاهی ده ازسایهء مشک بید(۶۱, ۱۱)

Ağ saçlı itburnu gülünün başını
Söyüdün qara kölgəsilə rənglə

Beytdəki «سیاهی » sözü göstərilən xüsusiyyətə malik olduğundan ona iki lüğət kartoçkası yazılmışdır.

Digər düzəltmə isimlərin də hər biri bu şəkildə lüğətdə əks olunur. Məs.:

سوی چشمهء زندگی راه جست    کنون یافت آن چشمه کانگاه جست(۶۳, ۴۷)

Həyat çeşməsinin yolunu axtardı
O vaxt axtardığı çeşməni indi tapdı

چوفتح سکندر در آمدبکار    دگرگونه شدگردش روزگار(۶۵, ۱۵)

İskəndərin qələbəsi başa çatcaq
Həyatın gedişi dəyişdi

درآن هردوگفتارچستی نبود    گزافه سخن رادرستی نبود(۶۶, ۳۵)

O hər iki sözdə uyğunluq yox idi
Qondarma sözlərdə düzlük yox idi

Beytdəki چشمه (çeşme), گردش (gərdeş), گفتار (qoftar) kimi düzəltmə isimlərin hər birinə iki, زندگی (zendegi) sözünə isə üc söz vərəqi yazılmışdır. Çünki bu sözdə söz düzəldici şəkilçidən başqa, iki saitin arasında işlənən bitişdirici samit də vardır.

Ümumiyyətlə, hər hansı bir əsərindəki düzəltmə sözlərin yaranma vasitələrinin dəqiq və hərtərəfli şəkildə lüğətdə verilməsi, onun müəllifinin daşıyıcısı olduğu dildə söz yaradılmasını öyrənmək baxımından çox böyük əhəmiyyətə malikdir. Odur ki, Nizaminin «Şərəfnamə» əsərinin lüğətində bu cəhətə çox həssas yanaşılmış, bu sahədə mövcud vasitələrin tam əksinə diqqətlə yanaşılmış, onlar, lüğətin münasib hərf bölmələrində yerləşdirilmişdir.

«Şərəfnamə»də işlənən isimlərdən böyük bir qrupu da dövlət başçıları, tarixi şəxsiyyət, alim, filosof, qoşun başçıları, döyüşçülər, əsərdəki bəzi personajlar, dövlət, ölkə, şəhər və s. kimi coğrafi yerlərin adlarını əhatə edir. Bir neçə cəhətdən maraq doğuran bu geniş adlar qrupu həm də quruluşca müxtəlifdir. Sadə, düzəltmə, mürəkkəb və tərkib şəkilli bu dil vahidləri tərkib hissələrə ayrılmadan, əsərdə olduğu şəkildə, münasib hərfin sözlüyündə verilir. Məs.:

ملک فیلقوس ازتماشای دشت    شکارافکنان سوی آن زن گذشت(۶۶, ۲۷)



Filqus şah çölü gəzərək, ov edə-edə o qadına tərəf getdi

چنین گفت رستم فرامرزرا    که مشکن دل وبشکن البرزرا(۱۹۹, ۱۲۰)

Rüstəm Fəramürzə dedi ki, Əlburzu sındır, qəlbini sındırma (qorxma)

نظامی که دررشته گوهرکشید    قلم دیدهارا قلم درکشید(۳۹, ۱۲۲)

İpə inci düzən Nizami yazılmışları yazmadı

جهان پهلوان نصرةالدین که هست    براعدای خودچوفلک چیره دست(۴۶, ۱۱)

Düşmənlərinə fələk kimi qələbə çalan Cahanpəhləvan Nüsrət-əd din

خوشاملک بردع که اقصای وی    نه اردیبهشتست بی گل نه دی(۲۴۸, ۳)

İstər Ordibeheşt (aprel), istərsə Dey (dekabr)da gülsüz olmayan Bərdə torpağı gözəldir.

بهشتی شده بیشه پیرامنش    زکرکوثری بسته بردامنش(۲۴۸, ۵)

Çölü-çəməni behiştə dönmüş, ətəyinə (torpağına) Kürdən Kövsər (behişt suyu) çəkilmişdir.

Beytlərdəki ملک فیلقوس (məlek Filqus), رستم (Rostəm), فرامرز (Fəramorz), نظامی (Nezami), البرز (Əlborz), نصرةالدین (Nosrət-əd-din), بردع (Bərde), کر (Kor), کوثر (Kousər) və «Şərəfnamə»dəki yüzlərlə başqa belə xüsusi isimlər lüğətin dil vahidlərinin zənginliyi və cəlbediciliyini artıran leksik incilərdir. Əlbəttə, belə isimlərin mənasının verilməsində leksik yox, ensiklopedik izahdan istifadə olunur.

Yeri gəlmişkən qeyd etmək lazımdır kt, Nizami Gəncəvinin dilində işlənən mürəkkəb isimlər bir sıra xüsusiyyətlərilə nəzər diqqəti cəlb edir ki, bunları əsasən üç qrupa bölmək olar:

1. Fars dilində işlənən və Nizami dili ilə eyni xüsusiyyətlərə malik mürəkkəb isimlər.
2. Nizami dilində işlənmiş və substantivləşmiş mürəkkəb sözlər.
3. Üslubi xarakterli mürəkkəb sözlər.

Başqa sözlə desək, Nizami Gəncəvinin dilindən kənarda onların əksəriyyəti isim kimi işlənə bilməzlər. Çünki, onlar Nizami şeriyyətinin poetik xüsusiyyətləri ilə əlaqədar məcazlaşaraq metafora, epitet, metonomiya, antiteza və s. kimi işlənmiş, demək, yeni leksik və semantik xüsusiyyətlər kəsb etmişlər. Əlbəttə, burada geniş istifadə olunmuş təşbihlərin də rolu böyükdür. Odur ki, Nizami dilindən belə mürəkkəb isimləri seçib onlara lüğət maddələri yazarkən deyilən cəhətlər nəzərdən qaçırılmamışdır.

Fikrimizi aydınlaşdırmaq üçün aşağıdakı sözlərin Nizami dilində mürəkkəb isim kimi işlənməsinə diqqət yetirək: سگدل (səgdel), پیلتن (piltən), سیبچهر (sibçehr), الماس دندان (əlmasdəndan), اژدهاپیکر (əjdəhapeykər) və s. kimi sözlərin mürəkkəbləşməsində məcazilik əsas rol oynayır. Yəni, bu sözlərin birinci komponentləri olan سگ، پیل، اژدها، الماس، سیب isimləri sifətləşərək

xasiyyət, keyfiyyət, əlamət və s. bildirirlər. Başqa sözlə, الماس kəsicilik, اژدها vahiməlik, سیب gözəllik, پیل nəhənglik, سگ pis xasiyyətlilik simvollarıdır ki, digər isimlərlə yanaşma vasitəsilə mürəkkəb sifətlər əmələ gətirmişlər. Aşağıdakı beytlərdə isə Nizami onları isim kimi işlətmişdir.

بقلب اندرون داشت باخویشتن    چوپولادکوهی شدآن پیلتن(۱۷۸, ۵۱)

Özü ilə mərkəzdə saxlayırdı
O filcüssəli, poladdan bir dağ idi.

گرآزرم خواهیم ازین سگدلان    نخواهندمان عاقلان عاقلان(۸۹, ۸۸)

Əgər o itürəklilərdən aman istəsək
Ağıllılar bizi ağıllı adlandırmazlar.

بدان سیبچهران مردمفریب    همی کردبازی چومردم بسیب(۲۱۷, ۳۹)

Adamaldadan o almaüzlərlə, alma ilə oynayan adamlar kimi oynayırdı.

Beytlərdə işlənmiş bu mürəkkəb isimlər müəyyən mərhələlər keçmişlər ki, həmin mərhələləri göstərmək, Nizami Gəncəvinin dilində işlənən başqa bu qəbildən olan sözləri müəyyənləşdirmək baxımından faydalı olacağını nəzərə alaraq, onların üzərində qısa şəkildə dayanmaq lazım gəlir.

Əvvəla, Nizami bu sözlərin birinci hissəsini təşbih obrazı kimi işlətmiş, yəni, qəhrəmanının bədənini yüksəklikdə filə, pis, xəbis ürək sahibini itə, üzü forma və hamarlılıq, məlahət, rəng və təravətlilikdə almaya oxşatmış, sonra onlar oxşayanla birlikdə bədii təyin və simvol kimi işlənərək mürəkkəb sifətlər əmələ gətirmişlər. Nəhayət, beytlərdə gördüyümüz kimi onlar şair tərəfindən isim, yəni substantivləşmiş sifətlər kimi işlənmişlər.

Odur ki, belə sözlər fars dilində isim+isim modelli sifətlər olsalar da, Nizami dilində sifət+isim modelində formalaşırlar. Onu da qeyd edək ki, Nizami dilində işlənən mürəkkəb isimlərin əksəriyyəti bu xüsusiyyətə malikdirlər və bu modellə düzələn, ilk baxışda sözbirləşməsini xatırladan bu növ sözlər onlardan həm forma, həm mürəkkəb morfoloji xüsusiyyətlər, həm də mənaca fərqlənirlər. Belə ki, müəyyən bir məna kəsb edir, hissələrə ayrılanda mənaları itir, tərkib hissələri arasına heç bir söz əlavə etmək mümkün olmur və nəhayət, bir vurğu ilə tələffüz edilirlər. Belə sözlərin mürəkkəb quruluşlu olmalarını göstərən bir xüsusiyyət də ondan ibarətdir ki, onlar həm sözdüzəldici şəkilçilər vasitəsilə yeni dil vahidi yaradır, həm də həmin nitq hissəsinə aid qrammatik kateqoriyaların daşıyıcısı olurlar. Aşağıdakı sözlər deyilənlərə misaldır:

سروبن (sərvbon) - sərvboylu, شیردل (şirdel) - şirürəkli, پریپیکر (pəripeykər) - pərigörkəmli, ناربن (narbon) - nar kolu kimi gözəl, گلبن(qolbon) - gül kolu kimi gözəl və ətirli, بادپای (badpay) - yelayaq, نخلبن (nəxlbon) - ucaboylu, پریروی (pəriruy) -pəriüzlü, شیرمرد (şirmərd) - şir qüvvəli), خاره سنگ (xaresəng) - qranit kimi möhkəm, کوه پاره (kuhpare) - dağ kimi möhkəm, مشتری پیکر (moştəripeykər) - müştəri kimi parlaq, خاربن (xarbon) - tikanlı, اژدهاخوی (əjdəhaxuy) - əjdəha xislətli, شیرزن (şirzən) - şir güclü qadın və s.



Bu kimi sözlərin hər birinə aid bir lüğət madddəsi verilir.

İkinci qrup mürəkkəb isimlər izafətin tərəflərinin yerlərini dəyişməsi, yəni اضافهء مقلوب (ezafe-ye məqlub) yolu ilə yaranmış sözlərdir. Məsələn:

چوزنگی درآمد بزنگانه رود    زشهرودرومی برآمدسرود(۱۱۰, ۵۵)

Zənci Zənqanəruda gömüləndə
Rumi Şəhrudundan şən səslər yüksəldi

زهندوستان شدبتبت زمین    زتبت درآمدبااقصای چین(۳۴۰, ۱۷)

Hindistandan Tibet torpağına getdi
Tibetdən Çin diyarına gəldi

نبردآزمایان ایرانسپاه    گرفتندبسرلشگرروم راه(۱۷۲, ۸۸)

İran qoşununun döyüşçüləri
Rum sərkərdəsinin yolunu tutdular

سپهدارچین هردم ازچین دیار    فرستادنزلی برشهریار(۳۷۴, ۲۰۳)

Çin qoşun başçısı Çin diyarından hər an
Şəhriyara(İskəndərə) sovqat göndərirdi

Beytlərdəki زنگانه رود (zənqanerud), شهرود (şəhrud), تبت زمین (tebetzəmin), ایرانسپاه (iransepah), چیندیار (çindiyar), Nizami dilində tez-tez təsadüf olunan bu qəbil sözlərə bir nümunədir ki, lüğətdə onların hər birinə bir söz maddəsi ayrılmışdır.

Nizami dilində işlənən mürəkkəb isimlərin bir qismi də izafət əlamətinin düşməsi, yəni حذ ف اضافه (həzf-e ezafe) nəticəsində yaranmışlar. Hər birinə ayrıca lüğət maddəsi ayrılmış belə sözlərə nəzər salaq: صاحب کلاه (sahebkolah) - tac sahibi, صاحب قران (sahebqeran) - şah, qüvvətli, صاحب سریر (sahebsərir) - şah, صاحب کمر(sahebkəmər) - şah, صاحب خبر (sahebxəbər) -xəbərçi və s.

خبربرد صاحب خبرنزد شاه    که مشتی ستم دیدهء دادخواه(۸۰, ۱۷)

Xəbərçi şaha xəbər apardı ki, ədalət istəyən bir qrup zülmgörmüş

شگفتی فروماند صاحب خرد    که نه آدمی بود ونه دام ودد(۴۳۳, ۳۰۳)

Ağılsahibi təəccübləndi ki, nə adam, nə heyvan nə də vəhşidir.

مرا ازکریمان صاحب زمان    تونی مانده باقی بمان(۳۱۰, ۲۲)

Mənə zamananın insaflılarından qalan sənsən, var ol

گروهیش خوانندصاحب سریر    ولایت ستان بلکه آفاقگیر(۴۳, ۴۲)

Bir qrup onu taxt sahibi, təkcə ölkə deyil, dünyanı tutan adlandırır .

Məlumdur ki, fars dilində elə sözlər olmuşdur ki, onlar, tarixən şəkilçiləşmişlər. Nizami dilində belə sözlərdən biri yer və zaman mənasında işlənən گاه (qah) - dır.

Onun sərbəst söz kimi işlənib leksik məna ifadə etməsinə klassik fars dilində də təsadüf olunur. Odur ki, tərkibində گاه (qah) işlənən sözlərin bir qismini mürəkkəb isim kimi qəbul etmək lazımdır. Məs.:

بتیغ افسروگاه خواهم گرفت     بدین اژدها ماه خواهم گرفت(۱۶۱, ۲۳)

Qılıncla tac, taxt alacağam, bu əjdəhayla(qılıncla) ayı alacağam

بائین جمشیدهرروزشاه     شدی برسرگاه درصبحگاه(۲۳۳, ۹۹)

Şah, hər gün, səhər Cəmşid aini ilə taxta qalxardı

گاه birinci beytdə «taxt», ikinci beytdə həm «taxt» və həm də mürəkkəb sözün tərkib hissəsində «vaxt» mənasında işlənmişdir.

گاه sözünün müstəqil şəkildə «vaxt, zaman» mənasına isə aşağıdakı beyt misal ola bilər.

جهانش گه صلح وجنگ آزمود     زجنگش زیان دید وازصلح سود(۸۵, ۳۶)

Dünya onu gah sülhdə, gah müharibədə sınadı, müharibədən ziyan, sülhdən xeyir gördü

Beytdə işlənən گه (gəh), گاه -ın qısa formasıdır.

«Şərəfnamə»də گاه ( گه )- la işlənən mürəkkəb isimlərə aşağıdakı sözləri də daxil etmək olar: خوابگاه(xabqah) - yataq, گذرگاه (qozərqah) - keçid, لنگرگه (ləngərqəh) - ləngər salınan yer, کارگاه (karqah) - emalatxana, iş yeri, نوبتگه (noubətgəh) - gözətçi yeri, رزمگاه (rəzmqah) - döyüş yeri, müharibə və s.

Onu da qeyd etmək lazımdır ki, Nizami dilində kopulativ, yəni, köməkçi vasitə olmadan iki və ikidən artıq sözün birləşməsi yolu ilə əmələ gələn isimlərdən başqa, determinativ, yəni, köməkçi vasitələrin iştirakı ilə yaranan mürəkkəb isimlərə də təsadüf olunur. Məsələn:

چوبدستی (çubdəsti) - məzəmmət, پامردی (pamərdi) - mərdlik, جهانپادشاهی (cəhanpadşahi) - dünya şahlığı, کشمکش (keşməkeş) - çəkişmə, سراپرده (sərapərde) - baş çadır, رسم و راه (rəsmorah) - adət- ənənə, مرزوبوم (mərzobum) - ölkə, ترانگاترنگ (təranqatərəng) - müxtəlif dəmir alətlərin biri-birinə toqquşmasından yaranan səs, نادلپسند (nadelpəsənd) - xoşagəlməz, داروگیر (darogir) - döyüş, müharibə və s bu kimi sözlərə lüğət maddələri yazılarkən buradakı ön, orta və sonda işlənən köməkçi söz düzəldici vasitələrə də ayrıca yer ayrılmış, onların funksiyaları göstərilmişdir. Məs.:

که چندین خلایق در این داروگیر     چراکشت بایدبشمشیروتیر(۱۱۱, ۸۰)

Ki, bu qədər insan bu müharibədə nə üçün qılınc və oxla ölməliydi.

Beytindəki داروگیر (dar-o-gir) - müharibə sözünə aşağıdakı lüğət maddələri yazılmışdır:



داروگیر (dar-o-gir) - müharibə

و (o) - sözdüzəldici orta şəkilçi( infiks).

Əlbəttə, lüğət maddələrinin hər birini onların işləndiyi beyt tamamlayır.

Aşağıdakı beyt isə ikidən artıq sözdən ibarət mürəkkəb isimlərin lüğətdə yerləşdirilməsi baxımından maraqlı olduğu üçün verilmişdir.

زده برمیان گوهرآگین کمر     درآورده پولاد هندی بسر(۹۶, ۱۸۹)

Belinə inci ilə bəzənmiş kəmər bağlayıb, başına poladdan hindi (papaq) qoyub...

Burada گوهرآگین کمر (qouhəraginkəmər), اضافهء مقلوب (ezafe-ye məqlub) - «izafətin çevrilməsi» yolu ilə mürəkkəb söz şəklinə düşmüşdür. Odur ki, bu kimi sözlərə bir lüğət maddəsi yazılmışdır.

B. SİFƏTLƏR: Məlumdur ki, bu nitq hissəsi məna çalarlarının zənginliyi ilə bərabər, həm də dərəcələrinə və quruluş növlərinə görə biri-digərindən fərqlənirlər. Lüğətdə sifətlərin yerləşdirilməsi, onların keyfiyyət dərəcələri və quruluş müxtəlifliyinə əsaslanmışdır. Belə ki, sifətlər Nizami dilində hansı dərəcədə verilsə də, onlar adi dərəcədə lüğətin sözlüyünə salınmış, dərəcə göstəriciləri isə ayrıca söz maddələrində verilmişdir. Aşağıdakı beytə diqqət yetirək:

تونی برترین دانش آموزپاک     زدانش قلم رانده برلوح خاک(۳, ۴)

Ən yüksək, təmiz bilik öyrədən, yer üzünə bilik səpən sənsən

Burada برترین (bərtərin) - Ən yüksək sözünə iki lüğət maddəsi yazılmışdır: بر və ترین

Söz maddələrinin hər birində beyt, səhifəsi və nömrəsi göstərilmişdir.

Qeyd etmək lazımdır ki, Nizami dilində hər bir nitq hissəsi, o cümlədən sifətlər çox vaxt isimləşir. Odur ki, lüğət maddələrinin daxilində, şairin dilində hansı nitq hissəsi kimi işlənməsi lazımi qeydlə nəzərə çatdırılır. Məs.:

سکندرچودانست کان تندمیغ     بتندربرآردهمی برق تیغ(۱۳۹, ۲۴)

İskəndər o qara buludun (Dara və qoşunu) coşmuş şirlərə (İskəndər və qoşununa) ildırım qılıncı yağdıracağını bilincə

Beytdəki تند میغ (tondmiğ) - qara bulud (Dara və qoşunu), تندر (tondər) - coşmuş şirlər (İskəndər və qoşunu) və برق تیغ (bərğtir) - ildırım qılıncı sözləri keyfiyyət bildirən sifətlər olsa da, burada substantivləşərək isim kimi işlənmişlər. Ona görə də bu sözlərin lüğət maddələrində onların bu xüsusiyyətləri haqqında lazımi qeydlər edilmişdir. Məs.:

تندمیغ (tondmiğ) - isim. Coşmuş tufan. Dara və onun qoşunu nəzərdə tutulur.

تندر (tondər) - İsim. Coşmuş şir. İskəndər və rum qoşunu nəzərdə tutulur.

برق میغ (bərqmiğ) - İsim. İldırım təsirli qılınc.

Əlbəttə, hər üç söz maddəsində beyt təkrarən verilir.

C. SAYLAR. Bu nitq hissəsinə aid söz maddələri aşağıdakılardan ibarətdir:

1. Miqdar sayları:

نه (noh) - doqquz

چونه مه برآمدبر آبستنی    بجنبش درآمدرگ رستنی(۶۷, ۴۷)

Hamiləliyindən doqquz ay keçincə, qurtuluş damarı hərəkətə gəldi

یک (yek) - bir

فروماندمردازز رانگیختن    وزان یک عدد درصدآمیختن(۲۳, ۸)

Kişi qızılın düşməsindən, birin yüzə qarışmasından mat qaldı.

Beytdəki صد (səd) də miqdar sayı olduğundan beyt həmin lüğət maddəsində təkrarən verilir, amma burada o, say yox, isim kimi təqdim edilir. Çünki, bu beytdə həmin say isimləşmişdir. Yəni:

صد (səd) - İsim. Yüz

فروماندمردازز انگیختن    وزان یک عدد درصدآمیختن(۲۳, ۸)

Və ya aşağıdakı beytə nəzər salaq:

که بسیارنایدبر اندکی    یکی وا صدآیدنه صدوایکی(۲۳, ۱۵)

Ki, çox azın yanına gəlməz, yüz birin yox, bir yüzün yanına gələr,

Əlbəttə, buradakı saylar rəqəmlərin adını bildirir və isimləşib. Odur ki, onlar söz maddələrində isim kimi təqdim edilmişlər. Burada, həm də yalnız miqdar sayları deyil, qeyri-müəyyən saylar اندک (əndək), بسیار (besyar) da substantivləşməyə məruz qalmışdır.

2. Sıra sayları məlumdur ki, م (om), امین (omin) və این (in) sözdüzəldici şəkilçiləri vasitəsilə əmələ gəlirlər. Odur ki, onların hər birinə iki söz maddəsi verilir. Məsələn:

باغازملک اولین رایتی    بپایان دورآخرین آیتی(۱۹, ۷۲)

Yaranışın ilk bayrağı, dövranın son ayətisən

Ç. ƏVƏZLİKLƏR. Bu nitq hissəsi Nizami dilində çox konkret mənalar kəsb edir. Burada izahat verəndə diqqət ona yönəldilmişdir ki, onlar nəyi və kimi əvəz edirlər. Söz maddələrində məhz əvəz olunan məfhumun özü, onun adı verilir. Misallara müraciət edək:

چوشدحجتت برخدانی درست    خرددادبرتوگوانی درست(۳, ۵)

Tanrılığına dəlil tapılan andan ağıl sənə şahid oldu

جواهرتوبخشی دل سنگ را    تودرروی جوهرکشی رنگ را(۳, ۱۰)

Daşı cəvahirə çevirən sənsən  Cəvahirə rəng verən sənsən



Beytlərdəki تو (to) Allaha müraciətlə işlənmişdir. Odur ki, buradakı həmin şəxs əvəzliyinin kimin adının əvəzində işləndiyi göstərilir. Yəni belə:

تو (to) - Sən (Allaha işarədir). Sonra beyt verilir.

Deyilənlərə aşağıdakılar da misaldır:

توبنشین گراوباتوجنگ آورد    بروتیغ توکارتنگ آورد(۱۲۳, ۸۷)

Sən otur gözlə, o səninlə müharibə edərsə, sənin qılıncın ona dünyanı dar edər.

زدست تویک تیغ برداشتن    زدشمن سروتیغ بگذاشتن(۱۲۳, ۸۸)

Səndən ələ qılınc almaq, düşməndən baş və qılınc vermək.

زدارانیایدبجزنای ونوش    گرآیدبتوخونش آیدبجوش(۱۲۳, ۹۰)

Dara əylənməkdən başqa  iş bilməz, sənə hücum edərsə qanı coşar.

شبیخون توتابیابان زنگ    تماشای اوتا شبستان تنگ(۱۲۳, ۹۲)

Sənin zəfərin Zəngibaradək, onun işi dar hərəmxanadır.

تودین پروری خصم کین پرورست    فرشته دگراهرمن دیگرست(۱۲۳, ۹۳)

Sən din, düşmən, kin yayır, mələk başqa, Əhrimən, başqadır.

توشمشیرگیری و اوجام گیر    تو برسرنشینی واوبرسریر(۱۲۳, ۹۴)

Sən, qılınc vurursan, o, badə içir, sən, başda, o, taxtda oturur.

توبادادی اوهست بیدادگر    تومیزان زوراوترازوی زر(۱۲۴, ۹۵)

Sən, ədalətli, o, ədalətsizdir. Sən, güc, o, qızıl tərəzisidir.

توبیداری اوبیخودی میکند    تو نیکی کنی اوبدی میکند(۱۲۴, ۹۶)

Sən, ayıq, o, huşsuzdur. Sən, yaxşılıq, o, pislik edir

Yuxarıda ədəbi priyom, yəni tərəf müqabillərin tutuşdurulması nəticəsində Əflatun və Aristotelin dili ilə deyilmiş bu beytlərdə تو (to), İskəndərə, او (u) isə Daraya işarədir. Lüğətdə hər iki əvəzliyin izahında «sən», «o» yazıb, onunla kifayətlənmək olmaz. Və ya həmin beytlərdə göstərilən əvəzlikləri təkrar kimi nəzərə almaq Nizami leksikasının xüsusiyyətlərinə biganəlik olar. Həm də, bu xüsusiyyətlər «Xəmsə» nin məsnəvilərini nəyə görəsə parçalayıb işlərkən meydana çıxır. Yəni hər hansı beyti əsərdən mücərrəd şəkildə, onun sözlərinin təhtəl-ləfz mənalarını nəzərə almadan işlərkən belə hallar üz verir. Həmçinin yuxarıdakı beytlərin hər biri ayrı götürülərsə, tərtibçi bu əvəzliklərin qarşısında, deyildiyi kimi, «sən» və «o»  yazıb işini bitmiş hesab edəcək.

Bu xarakterli digər əvəzliklərin mətni mənalarına da nəzər salaq:

برآن کس که شد دزدبنگاه من    بس است این مثل شحنهء راه من(۲۳, ۱۶)

Mənim mənəvi sərvətimin oğrusuna  yol gözətçisi məsəlim bəsdir.

گروهی زدیوان دستوراو    بحکمت نوشتندمنشوراو(۴۳, ۴۳)

Onun divanından olan bir qrup, onu filosof kimi qələmə aldılar.

بیونان زمین بودماوای او    بمقدونیه خاص ترجای او(۶۴, ۶)

Yaşadığı yer Yunanıstan, Məqduniyə (Makedoniya) vətəni idi.



7457
Azərbaycan Respublikası Prezidentinin
İşlər İdarəsi
PREZİDENT KİTABXANASI

وزین بیخبر بدکه پروردگار    چگونه وراپروردوقت کار(۶۵, ۲۳)

Allahın ona işdə kömək etməsindən xəbərsiz idi.

برآن مهربان شه چنان مهربان    که جزیاد اونامدش برزبان(۶۷, ۴۴)

O mehribana şah elə mehriban idi ki, yalnız onu xatırlayırdı.

نشایدسرازحکم اوتافتن    جزاوحاکمی کی توان یافتن(۱۵۵, ۱۰)

Onun hökmündən boyun qaçırmaq yaramaz. Ondan başqa bir hakim necə tapmaq olar.

بدستوری اوشوی شغل سنج    که دستوردانا به ازتیغ وگنج(۷۱, ۳۶)

Onun məsləhəti ilə işləyərsən. Çünki, ağıllı vəzir(məsləhətçi) qılınc və xəzinədən yaxşıdır.

چوکردزبانی سپه رازبون    نیامدبناورداوکس برون(۹۶, ۱۸۶)

Vəhşi döyüşçü qoşunu zəbun etdiyindən, onunla vuruşa bir kəs çıxmadı.

Beytlərdən göründüyü kimi, من , او və وی əvəzliklərinin mətni mənaları müxtəlifdir, yəni sıra ilə Nizami, İskəndər, Filiqus, yenə İskəndər, Filiqusun kənizi, Allah, Ərəstu və Zərracəni əvəz edirlər. Belə əvəzliklərə «Şərəfnamə» də çox təsadüf olunur, lüğət maddələrində göstərilən xüsusiyyətləri nəzərə alınaraq onların mətni mənaları verilmişdir.

Onu da qeyd etmək lazımdır ki, Nizami dilində او (u) əvəzliyi universaldır, həm canlı, həm də cansız varlıqları əvəz etməyə qadirdir. Məs.:

زهردانشی کوبودرقیاس    وزوگرددانديشه معنی شناس(۷۰, ۱۸)

Məlum olan, ağlın dərk etdiyi hər bir elmi…

جهان چیست بگذرزنیرنگ او    رهانی بچنگ آورازچنگ او(۷۳, ۶۱)

Dünya nədir? Onun fitnəsindən uzaq, çəngindən azad ol

Yuxarıdakı beytlərdə او əvəzliyi birincidə iki dəfə elm, bilik, ikincidə dünya sözünü əvəz etmişdir.

Nəzərə alınsa ki, «Şərəfnamə»də külli miqdarda canlı və cansız personajlar mövcuddur və او (u) onları münasib şəkildə ifadə imkanına malikdir, o zaman bu şəxs əvəzliyinin müəyyənləşdirilməsinin nə qədər çətin və maraqlı olduğu aydınlaşar.

Buna görə də yuxarıda verilən qeydləri burada təkrar etməyə dəyər ki, hər hansı bir əsərin lüğətini yazarkən onun sözlərini əvvəldən, düzgün olmadan müəyyənləşdirib əlifba sırasına düzüb, onlar əsasında məna yazmaq məqsədəuyğun iş deyil. Çünki, başqa söz maddələri kimi əvəzliklərin də mətni mənalarını vermək üçün, onu əsərdən ayrılmış beytlər əsasında yox, əsər əsasında yazmaq lazımdır. Misal üçün, yuxarıdakı beytlərdəki əvəzlikləri əsərdən kənar oxuyanda bilmək olmur ki, orada



kim və nə nəzərdə tutulmuşdur. Bu, xüsusilə o beytlərdə nəzərə çarpır ki, əvəz olunanın adı çəkilmir. Məsələn aşağıdakı beytdə, ayrıca, mətndən kənar «o» dedikdə kimin nəzərdə tutulduğu məlum olmur.

گروهی زدیوان دستور او    بحکمت نوشتند منشوراو(۴۳, ۴۳)

Onun divanından olan bir qrup, onu filosof kimi qələmə aldı.

Yəqin ki, lüğət tərtibçisi ona verilən beytdə او-nun qarşısında «o» yazaraq, işini bitmiş hesab edəcək. Tərtibçi mücərrəd şəkildə ona verilmiş bu beytdə söhbətin İskəndərdən getdiyini haradan bilə bilər.

Qeyd etmək lazımdır ki, bəzən Nizami özü tərtibçinin köməyinə çatır. Yəni, aşağıdakı beytdə, gördüyümüz kimi, Nizami beytin birinci misrasında, aydın şəkildə bir şey haqqında sual verir, ikinci misrada, onu əvəzlik vasitəsilə aydınlaşdırır, söz təkrarının qarşısını alır. Məs.:

جهان چیست بگذرزنیرنگ او    رهانی بچنگ آورازچنگ او(۷۳, ۶۱)

Burada şair özü aydınlaşdırır ki, «onun fitnəsi», «onun çəngi» dedikdə, «o» dünyadır. Bunu «dünyanın hiyləsi», «dünyanın çəngi» kimi başa düşmək lazımdır. Və ya:

زهردانشی کوبودرقیاس    وزوگرددانديشه معنی شناس(۷۰, ۱۸)

Burada, iki təyin budaq cümləsi vasitəsilə müəyyənləşir ki, beytdə qısa şəkildə verilən او (u), دانش –in əvəzedicisidir və onun təkrarən daha iki dəfə verilməsinin qarşısını alır.

Əlbəttə, yuxarıda deyilənlər başqa əvəzliklərə də aid edilməlidir. Odur ki, onlara aid söz maddələrində göstərilən cəhətlər imkan daxilində nəzərə alınmışdır. Aşağıdakı beytə nəzər yetirək:

خدایا جهان پادشائی تراست    زماخدمت آید خدائی تراست(۳, ۱)

İlahi, dünya şahlığı sənindir. Bizlər xidmətçiyik, şahlıq sənindir.

Burada, Nizami «ما» dedikdə birinci şəxsin cəmi bizi yox, bizləri, yəni Allahın yaratdıqlarını, bütün varlıqları nəzərdə tutmuşdur. Buradakı ما –nı mücərrəd şəkildə ayırıb onu «biz» kimi təqdim etsək, bir qrup şəxs nəzərdə tutular, məna pozular. Burada yaradanla yaranmışlır müsbət mənada bədii oppozisiyadır. Dünya padşahı və onun bəndələri.

Dediklərimizi yenə də Nizami öz sözlərilə təsdiqləyir:

همه آفریدست بالاوپست    تونی آفریننده‌ء هرچه هست(۳, ۴)

Yuxarı, aşağı, hamısı yaranandır. Mövcud olanları yaradan sənsən.

Beytdə, sanki, şair yuxarıdakı ما –nı همه əvəzliyi vasitəsilə açır, همه isə هرچه هست -i müəyyənləşdirir. Başqa sözlə, Nizami özü çox maraqlı sinonim cərgəsi verərək ما –nı izah edir.

Yəni: ما – همه – هرچه هست – biz = hamı = mövcud olan hər şey

خدا – جهان پادشائی – آفریننده - Allah = dünya şahlığı = yaradan

Verilən misallardan bir daha aydınlaşır ki, qeyri-müəyyən əvəzlikləri ilə əlaqədar söz maddələrini yazarkən bədii ədəbiyyatın, o cümlədən Nizami dilinin bütün incəliklərini götür-qoy etməli, deyilənlərə əməl olunmalıdır.

Nizami dilində işarə əvəzlikləri ilə əlaqədar da maraqlı cəhətlərlə qarşılaşırıq. Belə ki, başqa bədii ədəbiyyatın dilində olduğu kimi, «Şərəfnamə»də də işarə əvəzlikləri hər zaman konkret bir varlığı ifadə edir. Odur ki, şairin dilində işarə əvəzliklərinin söz maddələrinin sayı və mənaları qeyri-məhduddur. Dediklərimizə aşağıdakılar misal ola bilər:

بموکب روان لشگر از هرکنار          نه چندان که داندکس آنر اشمار(۱۱۴, ۲۵)

Hər tərəfdən gələn süvari qoşun hər kəsin onu saya biləcəyi qədər deyildi.

حسابی بجزکامرانی نداشت          ازآن به کسی زندگانی نداشت(۱۱۹, ۱۶)

Xoşbəxtlikdən başqa bir şey yox idi, heç kəsin bundan yaxşı həyatı yox idi.

گه این مغزآنر ابمنقارخست          گه آن بال اینر ابناخن شکست(۱۲۰, ۴۱)

Gah bu, onun beynini dimdikləyir, gah o, bunun qanadını caynağı ilə qırırdı.

ترآن کفایت که شمشیرمن          نیاردسرتخت توزیرمن(۱۳۲, ۵۱)

Sənə o bəsdir ki, mənim qılıncım sənin taxtını mənim altıma gətirmir (səni taxtdan salmır).

برآنم میاور که عزم آورم          بهم پنجه باتورزم آورم(۱۳۲, ۵۴)

Məni məcbur etmə ki, gəlib səninlə müharibədə pəncələşəm

زچوگان وگوی اندرآمدنخست          که طفلی توبازی بدین کن درست(۱۳۵, ۸۸)

Əvvəl çövqanla top ortaya gəldi ki, sən uşaqsan, bunlarla oyna.

چه خواهی زمن باچنین بودسست          همان گیرنابوده بودم نخست(۱۲, ۳۷)

Belə halsız varlığımdan nə istəyirsən, onu götür, əvvəldən yox idim.

چنان برکشیدی وبستی نگار          که به زان نیاردخردرشمار(۴, ۱۴)

Sən şəkli elə çəkib düzəltdin ki, ağıl ondan yaxşısını düşünə bilməz.

چنان آفریدی زمین و زمان          همان گردش انجم وآسمان(۴, ۱۸)

Zamanı, yeri, ulduzların, asimanın hərəkətini elə yaratdın ki, …

که آنرا شمردن توان درقیاس          کسانیکه هستند لشگرشناس(۱۳۸, ۱۹)

Ki, onun sayını qoşuna bələd adamlar müəyyənləşdirə bilərlər.

Yuxarıdakı beytlərdə işlənmiş işarə əvəzliklərinin ifadə etdikləri mənaların müxtəlifliyini nəzərə alaraq, onların hər birinə ayrıca söz maddəsi ayrılmışdır. Belə ki, həmin işarə əvəzlikləri, sıra ilə aşağıdakı mənalarda işlədilmişlər: İskəndərin qoşunu, xoşbəxt həyat, uzaq kəklik,



yaxın kəklik, qılıncın onu kəsməməsi, müharibəyə başlamağa, kuy və çövqan, istədiyi, yaranışın tərzi və Daranın qoşununa işarədir.

Və ya aşağıdakı beytdə آن və این - in mənalarına baxaq:

اگر رومی اندیشدازجنگ زنگ          عجب نیست کین ماهیست آن نهنگ(۸۹, ۸۶)

Rumi Zəngilərlə müharibə etmək fikrindədirsə, təəccüblü deyil, çünki, bu, balıq, o, nəhəngdir.

Beytdəki آن və این -in qarşısında onların nominativ mənalarını yazmaqla kifayətlənmək və ya müvafiq kartoçkalarda onların işləndiyi beytin səhifə və nömrəsini yazmaqla iş başa çatdırılmamış, beytdə onların nəyə işarə etdikləri müəyyənləşdirilmişdir. Belə ki, burada این, زنگی –ni, آن, رومی –ni əvəz etdiyindən, lüğətdə həmin mənalar bu əvəzliklərin yeni söz maddələrinin artmasına səbəb olur.

Məlum olduğu kimi, bu işarə əvəzliklərinin bir xüsusiyyəti də ondan ibarətdir ki, onlar təyin rolunda sözlərə yanaşaraq, söz birləşməsi əmələ gətirirlər. Bu zaman onlar, təyin etdikləri sözlə birlikdə konkret mənalar ifadə edirlər. Yəni, lüğət maddələrində həmin birləşmələrdəki təkib hissələri ayrılmamış və müəyyən söz maddələrində, yəni işarə əvəzliyinin maddəsində verilmişdir. Beytlərə müraciət edək:

درین عالم آبادگرددبگنج          درآن عالم آزادگرددزرنج(۶, ۵۲)

Bu dünyada xəzinə ilə məmnun olar, o dünyada əziyyətdən azad olar.

Beytdə این عالم (in aləm) və آن عالم (an aləm) birləşmələrində məlumdur ki, insanın yaşadığı bu dünya və öldükdən sonra getdiyi o dünya nəzərdə tutulur. Bu birləşmələrin mənasını konkretləşdirən این və آن –nı oradan ayıranda məna itir, عالم sözü bir məna ifadə edir. Aşağıdakılar o cümlədəndir:

که بدل شدنداین سپاه دلیر          زشمشیرناخورده گشتند سیر(۸۸, ۷۳)

Ki, bu cəsarətli qoşun, qorxdu, qılınc zərbəsini dadmamış, doydu.

بلشگرتوان کردن این کارزار          بتنهاچه برخیزدازیک سوار(۸۸, ۷۴)

Bu müharibəni qoşunla etmək olar, tənha bir süvari əsgərdən nə çıxar.

گرآزرم خواهیم ازین سگدلان          نخوانندمان عاقلان عاقلان(۸۹, ۸۸)

Əgər bu itürəklilərdən aman istəsək, ağıllılar bizi ağıllı adlandırmaz.

چوآن آدمی خواره یابدخبر          که هست آدمیخوارهء زوبتر(۹۰, ۱۰۳)

Əgər o adamyeyən, ondan da artıq adamyeyən olduğundan xəbər tutsa…

سکندرچودانست کان تندمیغ          بتندربرآردهمی برق تیغ(۱۳۹, ۲۴)

İskəndər o qara buludun coşmuş şirlərə ildırım qılıncı yağdıracağını bilincə

سیاهی گرفتی سپیدی بگیر          چنین ابلقی بایدت ناگزیر (۱۲۰, ۲۷)

Qaranı (Zəngibanı) aldın, ağı (İranı) da al, belə ala-bula sənə vacibdir.

Oxşarlarını daha çox gətirə biləcəyimiz bu beytlərdə این سپاه دلیر (in sepah-e dəlir) İskəndərin qoşununa, این کارزار (in karzar) Rum və Zəngi müharibəsinə, این سگدلان (in səgdelan) zəngilərə, آن آدمی خواره (an adəmixare) Zənci sərkərdəsinə, چنین ابلق (çenin əbləğ) İran və Zəngi qarışığı(ala-bula) na, آن تندمیغ (an tondmiğ) Daraya işarədir. Öz-özlüyündə aydındır ki, bunları işarə əvəzliklərindən ayrı işlətsək, əvvəla, həmin birləşmələr sözə çevrilər, ikinci, Nizami dilində işlənən mənalarını itirər, üçüncü, şairin leksik üslubuna xələl gətirərlər.

Bu birləşmələrdə nəzər diqqəti cəlb edən bir cəhət də ondan ibarətdir ki, onlar əsərdə personajları xarakterizə edən epitetlərdir. Epitetlərin lüğətdə verilməsinin bir xüsusiyyəti də odur ki, onları mənalandıranda müəllifin semantik üslubiyyatı əsas götürülmüşdür. Verilən dil vahidlərinin mənaları məhz Nizaminin bu üslubuna əsaslandığı üçün düzgün hesab olunur və bu prinsipə riayət olunur.

İşarə əvəzliklərinin başqa bir xüsusiyyəti də yuxarıda, cümlənin qeyri-müstəqil üzvlərindən bəhs olunanda verilmişdir.

Nizami dilində diqqəti cəlb edən cəhətlərdən biri də burada işlənən *bitişən əvəzliklərin geniş işlənməsidir*. Belə əvəzliklərə fars dilində müxtəlif nitq hissələrinə aid qrammatik kateqoriyalar göstəricisi olsalar da, hər zaman özündə şəxs yükünü daşıyan və fars dilində aşağıdakı terminlər adı altında üç qrupa ayrılan sözdəyişdirici şəkilçilər daxildir:

1. ضمایر متصلهء نسبی (zəmayer-e mottəsele-ye nesbi) - Nisbət şəkilçiləri

2. ضمایر متصلهء شخصی (zəmayer-e mottəsele-ye şəxsi) - Şəxs sonluqları

3. ضمایرمتصلهء مفعولی (zəmayer-e mottəsele-ye məf'uli) - Tamamlıq vəzifəsində işlənən bitişən əvəzliklər.

Fars dilində qrammatik formalar yaradan bu şəkilçilərin hər birinə aid bir söz maddəsi ayrılmış, onların qarşısında leksik- qrammatik funksiyaları göstərilmişdir. Aşağıdakı söz maddələrinə nəzər salaq:

ت (ət) – II ş. t. nisbət şəkilçisi

چوشدحجتت برخدائی درست　　　خرددادبرتوگوائی نخست(۳, ۵)

Xudalığa dəlilin tapılınca, birinci, ağıl sənə şahid oldu.

ت (ət) - II ş. t. vasitəli və vasitəsiz tamamlıqları bildirir.

بهرگوشه کافتم ثناخوانمت　　　بهرچه باشم خدادانمت(۹, ۸۹)



Hansı küncdə olsam sənə dua edirəm, nə olsam səni xuda bilirəm

ت (ət) - II ş. t. vasitəsiz tamamlığı bildirir.

پسندیدگی کن که باشی عزیز　　　پسندیدگانت پسندندنیز(۴۰, ۸)

Düzgünlüyə rəğbət et ki, əziz olasan, rəğbətə layiq olanlar da sənə rəğbət etsinlər.

مان (-e man) - I ş. c. vasitəsiz tamamlığı bildirir

گرآزرم خواهیم ازین سگدلان　　　نخوانندمان عاقلان عاقلان(۸۹, ۸۸)

Əgər bu itürəklilərdən aman istəsək, ağıllılar bizi ağıllı adlandırmazlar.

ام (əm) - I ş. t. vasitəli tamamlığı bildirir.

چه فرمایدم شاه فیروزرای　　　که فرمان فرمانده آرم بجای(۱۳۴, ۸۳)

Qələbə fikirli şah mənə nə buyursa, buyuranın buyruğunu yerinə yetirərəm.

FELLƏR. Bu nitq hissəsi ilə əlaqədar aşağıdakı lüğət maddələri mövcuddur.

1. Müstəqil mənalı, ayrıca şəkildə işlənən bütün sadə fellərin Nizami dilində, o cümlədən, «Şərəfnamə»dəki qrammatik formasından asılı olmayaraq, məsdərləri. Qrammatik forma dedikdə, təbii ki, felin təsrif olunan şəkilləri nəzərdə tutulur. Bunlar da felin zaman, şəxs, kəmiyyət, *tərz, təsdiq və inkar kateqoriyaları* əsasında meydana çıxır. Məsələn:

پژوهندهء گفت بدخواه مست　　　شب و روز غافل شدآنجا که هست(۱۳۸, ۱۴)

Kəşfiyyatçı dedi ki, oradakı məst düşmən, bütün günü xəbərsizdir.

رسیدندزنهاریان خیل خیل　　　که طوفان بدریادرآوردسیل(۱۳۸, ۱۲)

Məzlumlar sürü ilə gəlib dedilər ki, tufan dənizə sel gətirdi.

سکندر چودانست کان تندمیغ　　　بتندربرآردهمی برق تیغ(۱۳۹, ۲۴)

İskəndər o qara buludun coşmuş şirə ildırım qılıncı yağdıracağını bilincə

فرستاد تا لشگراز هردیار　　　روانه شود بردرشهریار(۱۳۹،۲۵)

Göndərdi ki, hər diyardan şahın sarayına qoşun gəlsin

Misal gətirdiyimiz beytlərdə گفتن ،رسیدن، دانستن، فرستادن sadə felləri lüğətdə məsdər formasında verilmiş, onların qrammatik forma göstəricilərinin (zaman, şəxs) hər biri müvafiq lüğət maddələrində yerləşdirilmişlər.

2. Məlum olduğu kimi fars dilində müstəqil mənalı düzəltmə fellər də yox deyildir. Belə ki, bir qrup fellər, sadə fellərin kökünə müəyyən şəkilçilərin artırılması yolu ilə əmələ gələrək, yeni qrammatik məna kəsb edirlər, başqa sözlə desək, təsirlilik kateqoriyasına mənsub olurlar. Belə şəkilçilərə آن və آنی -ni misal göstərmək olar. Həmin şəkilçilər lüğətdə ayrıca söz maddəsi təşkil edirlər. Məs.:

بدارا رساند از اسکندرجواب   جوابی گلوگیرچون زهرناب(۱۳۶, ۱۰۴)

İskəndərdən Daraya xalis zəhər kimi boğaz tıxayan bir cavab çatdırdı

Beytdəki رساندن (rəsandən) - çatdırmaq təsirli feli, رسیدن (rəsidən) - çatmaq təsirsiz feldən orta şəkilçi (infiks) vasitəsilə həm şəklini, həm də mənasını dəyişmiş düzəltmə fel olduğundan, lüğətdə ona iki söz maddəsi ayrılmışdır.

3. Prefiksli fellərə də lüğətdə iki söz maddəsi ayrılmışdır. Yəni belə quruluşlu fellərin mənalandırılmasında həmin prefikslərin xüsusi leksik - qrammatik xüsusiyyətləri olduğundan, onların ayrıca söz maddələrində verilməsi zərurəti yaranmışdır. Məsələn:

فروبسته چشم آن تن خوابناک   بدوگفت برخیزازاین خون وخواب(۱۸۳, ۱۱۵)

O yuxulu bədən, gözübağlı ona dedi: Bu qan və yuxudan uzaq ol.

درخت کیانرافروریخت بار   کفن دوخت بردرع اسفندیار(۱۸۷, ۱۷۹)

Kiyan ağacının barını tökdü, İsfəndiyara zireh əvəzinə kəfən tikdi.

شبانگه که صدرنگ بیندبکار   برآیدبصددست چون نوبهار(۱۹۱, ۲۲۲)

Yüz oyunlu gecə, təzə bahar kimi əli (ulduz çiçəklərilə) dolu gəlir

چوآیی بدرگاه مهدی فرود   بمهدمن آورزمهدی درود(۱۹۱, ۴)

Mehdinin dərgahına üz qoyanda, mənim qəbrimə (ruhuma) Mehdidən rəhmət dilə.

نوازادهٔ زنگه راباز جست   طلب کردوزنگارازآیینه شست(۱۹۶, ۷۶)

Zəngənin nəvəsini soraqladı, çağırıb kini yox etdi

چوآمدبدهلیزدرگه فراز   زمانی برآسودازان ترکتاز(۲۵۵, ۹۰)

Sarayın eyvanına qalxdı, bir müddət yürüşdən dincəldi.

Beytlərdə işlənən برخاستن (bər xastən), فروریختن (foru rixtən), برآمدن (bər amədən), فرودآمدن (forud amədən), بازجستن (baz costən), فراز آمدن (fəraz amədən) kimi fellər prefikslərlə birlikdə verilir.

4. Onu da qeyd etmək lazımdır ki, fars dilində, o cümlədən, «Şərəf-namə» də kökalma baxımından çoxlu qaydasız fellər vardır. Bu fellərin ayrıca verilməsi də nəzərdən qaçmamış, onların hər birinə bir lüğət maddəsi ayrılmışdır.

5. Mürəkkəb fellər adı altında o fellər nəzərdə tutulur ki, onlar isim hissəsi və köməkçi fellərdən ibarətdirlər. Bəzən isə, köməkçi fellər, həm də *müstəqil mənada işlənmə xüsusiyyətinə malikdirlər. Belə halları* nəzərə alaraq, həmin fellərin isim hissəsi baş söz kimi ayrıca götürülür, mənası verilir, sonra, həmin söz maddəsinin müvafiq yerində, köməkçi fellə əmələ gələn mürəkkəb fel verilir. Məs.:

بکام از جوانی توانی رسید   چوپیری رسدگوشه باید گزید(۱۹۸, ۹۶)

Cavanlıqda kama çatmaq olar, qocalıqda küncə çəkilmək gərək.



Beytdə mürəkkəb fel şəklində verilmiş گوشه گزیدن (quşe qozidən) - künc axtarmaq idiomatik ifadəsi lüğətdə گوشه (quşe) - künc söz maddəsində yerləşdirilmişdir. Aşağıdakı beytlərdə təsadüf olunan چاره سازی کردن (çaresazi kərdən), ایمن شدن (imən şodən), خبرداشتن (xəbər daştən), چاره دیدن (çare didən) kimi fellər də bu qəbildəndir.

بافکندنش چاره سازی کنند   وزودعوی بینیازی کنند(۱۹۸, ۱۰۱)

Onu yıxmaq üçün yol axtararlar, ona möhtac olmadıqlarını bildirərlər.

بپوشیدن وخوردن نیک بهر   شدندایمن از خوردن تیغ وزهر(۱۹۸, ۱۰۵)

Yeyib geymək qismət oldu, oxlanmaq, zəhərlənməkdən arxayınlaşdılar.

چوشه دیدکان یادگارکیان   خبر دارداز کارسود و زیان(۱۹۸, ۱۰۶)

Şah o Kiyan yadigarının faydalı və ziyan işlərdən xəbərdar olduğunu bilcək.

همان چاره دیدآن خردمندشاه   که بردارد آن بنداز آن بندگاه(۲۹۰, ۳۵)

O ağıllı şah, o bağlı yerdən o bəndi götürmək üçün yol aradı.

6. Tərkibi fellər. Fars dilində, o cümlədən «Şərəfnamə»də, yuxarıda göstərilənlərdən başqa külli miqdarda ikidən artıq hissədən ibarət tərkibi fellər mövcuddur. Nizami dilində, həm tərkib, həm say və həm də mənaca maraqlı olan bu fellərin lüğətdə yerləşdirilməsi böyük diqqət tələb etmişdir. Aşağıdakı tərkibi fellərə baxaq:

جوزبرگنبدانداختن (couz bər qonbəd əndaxtən) - faydasız iş görmək, بزانونشستن (be-zanu neşəstən) - diz çökmək, بخدمت کمربستن (be-xedmət kəmər bəstən) - xidmət etmək, بمردم درآمیختن (be-mərdom dər amixtən) - adamlarla ünsiyyətdə olmaq, قصهٔ سخت رونی خواندن (qesse-ye səxtrui xandən) - sərt olmaq, جای بلبل بزاغ دادن (ca-ye bolbol be-zağ dadən) - bülbülün yerini qarğaya vermək, بزرگی بدست آوردن (bozorgi be-dəst avərdən) - boyüklük əldə etmək, برخدمت کمربستن (bər xedmət kəmər bəstən) - xidmət etmək, qulluğunda durmaq

Bu dil vahidlərini, əlbəttə, tərkib hissələrə ayırmaq olmaz. Çünki, əsasən frazeoloji ifadələr kimi işlənən bu tərkibi fellərdə elə bir özək söz vardır ki, o, bu dil vahidlərinin mənasını açmaqda əsasdır. Yuxarıdakı ifadələrin beytlərdə işlənməsinə diqqət yetirək:

چوعاجزشدندانداران تاختن   وزان جوزبرگنبد انداختن(۲۹۱, ۴۲)

O yürüşdən, o faydasız işdən bezəndə

شه ازمهربانی بدودادست   درون رفت و پیشش بزانونشست(۲۹۳, ۶۶)

Şah mehribanlıqla ona əl verdi, içəri keçib qarşısında diz çökdü

هزارش زن بکردرپیشگاه   بخدمت کمربسته هریک چوماه(۲۵۰, ۲۶)

Sarayında min bakirə qız, hər biri bir ay kimi xidmətində durmuşlar.

بمردم درآمیز اگر مردمی    که باآدمی خوگرست آدمی(۲۶, ۱۶)

Adamsansa adamlara qarış, çünki, adam adamla ünsiyyətdə olar.

چوپی سست وپوسیده گشت استخوان    دگرقصهء سخت روئی مخوان(۲۶, ۲۱)

Ayaq süstləşib, sümük kövrəkləşəndə daha sərtlik etmə.

چوباد خزآنی درآیدبباغ    زمانه دهدجای بلبل بزاغ(۲۶, ۲۴)

Payız küləyi bağda əsərsə, zamana bülbülün yerini qarğaya verər.

دلاتا بزرگی نیاری بدست    بجای بزرگان نشاید نشست(۳۰, ۳)

Ey ürək, boyüklük əldə etməyincə, böyüklərin yerində oturmaq yaramaz

فرستاد نزلی سزاواراو    کمربست برخدمت کاراو(۲۵۴, ۷۷)

Ona layiq sovqat göndərdi, işdə ona xidmət etdi.

İndi beytlərdə verilən tərkibi fellərin özək sözlərinə diqqət yetirək:

گنبد – جوزبرگنبد انداختن (couz bər qonbəd əndaxtən) - faydasız iş görmək

زانو – برزانونشستن (bər zanu neşəstən) - diz çökmək

خدمت – بخدمت کمربستن (be-xedmət kəmər bəstən) - qulluq göstərmək

مردم – بمردم درآمیختن (be-mərdom dər amixtən) - adamlara yovuşmaq

سختروئی – قصهء سختروئی خواندن (qesse-ye səxtrui xandən) - qürrələnmək

بلبل – جای بلبل بزاغ دادن (ca-ye bolbol be-zağ dadən) - bülbülün yerini sara vermək

بزرگی – بزرگی بدست آوردن ( bozorgi be-dəst avərdən) - böyük mənsəb əldə etmək

خدمت – برخدمت کمربستن (bər- xedmət kəmər bəstən) - qulluq göstərmək

Göstərilən fel tərkibləri sabit ifadələr olduğundan, onları parcalamaq olmaz. Əgər belə edəriksə, onlar ya sadə, ya prefiksli ya da mürəkkəb şəklə düşərək, mənalarını dəyişəcəklər. Belə hallar baş verməsin deyə, yuxarıdakı və bu tipli digər tərkibi fellərin özək sözü müəyyənləşdirilmiş, sonra, ifadə orada yerləşdirilmişdir. O cümlədən olan yuxarıdakı özək sözlərin hər biri üçün lüğətdə söz maddələri ayrılmış, onların nominativ mənaları qeyd olunandan sonra, müvafiq yerdə ifadələr verilmiş, Nizami dilində işlənən mənası və ona şahidlik edən beyt göstərilmişdir. Məs.:

زانو (zanu) - diz...بزانو نشستن (be-zanu neşəstən) diz çökmək, təzim etmək

شه ازمهربانی بدوداددست    درون رفت وپیشش بزانو نشست(۲۹۳, ۶۶)



Şah mehribanlıqla ona əl verdi, içəri keçib qarşısında diz çökdü

Onu da qeyd etmək lazımdır ki, bəzən bir tərkibi fel müxtəlif önqoşmalarla işlənir. Əlbəttə, bu xüsusiyyətə həm fars dilinin başqa yazılı abidələrində, həm də Nizami dilində təsadüf olunur. Belə ki, önqoşmalar və sonqoşma belə abidələrdə biri digərini əvəz edərkən öz nominativ mənalarından uzaqlaşır, rəngarənglik yaradır. Bəzən isə bir ifadə sinonim mənalı iki önqoşma vasitəsilə yanaşı işlənir. Dediklərimizə بخدمت کمر بستن və برخدمت کمر بستن misal ola bilər. Burada, به və بر eyni qrammatik funksiyalara malikdir. Belə hallarda Nizami dilinin ifadələri orijinalda olduğu kimi verilir. Yəni bu ifadələrin ikisi də olduğu kimi خدمت lüğət maddəsində, əlifba sırasına əsasən göstərilir. Deyilənlər nəzərə alınaraq, həmin tərkibi fellərin lüğətdə yerləşdirilməsinə nəzər yetirək:

خدمت (xedmət) - qulluq, xidmət...بخدمت کمربستن (be-xedmət kəmər bəstən) qulluq etmək, xidmət etmək

هزارش زن بکردرپیشگاه    بخدمت کمربسته هریک چوماه(۲۵۰, ۲۶)

Onun sarayında hər biri bir ay kimi (gözəl) min bakirə qız ona xidmət edirlər.

برخدمت کمربستن (bər- xedmət kəmər bəstən) qulluq etmək, xidmət etmək

فرستادنزلی سزاواراو    کمربست برخدمت کاراو(۲۵۴, ۷۷)

Ona layiq sovqat göndərdi, işdə ona xidmət etdi.

7. Fel kökləri. Lüğətin bir hissəsini də fel kökləri təşkil edir. Əlbəttə, bu qism lüğət maddələri, yalnız qaydasız felləri əhatə edir. Onların qarşısında hansı məsdərin kökü olduğu göstərilir. Bəzən, bu köklər, Nizami dilində isim kimi işlənərək ayrıca məfhum ifadə edirlər. Bu halda, o başqa bir söz maddəsində verilir, qarşısında «isim»sözü yazılır. Məs.:

سوز (suz) - سوختن (suxtən) felinin kökü.

زبی آبیم سینه سوزد درون    قدم تاسرم غرق دریای خون(۱۸۶, ۱۵۷)

İçərimdə sinəm susuzluqdan yanır, təpəmdən dırnağa qədər qan dənizinə qərq olmuşam.

سوز (suz) - isim, dərd, kədər

سرآغازکردآنگهی رازخویش    بزدسوزخویش اندران سازخویش(۴۴۹, ۵۳۹)

Sonra öz sirrini deməyə başladı, öz kədərini belə bəstələdi.

8. Feli sifətlər. Nizami dilində, o cümlədən «Şərəfnmə»də feli sifətlər bir neçə cəhətdən nəzəri cəlb edir. Əvvəla, onların sonundan feli sifət şəkilçisinin ixtisarı müşahidə olunur. Bu hal daha çox انده (ənde) şəkilçisi ilə düzələn indiki zaman feli sifəti ilə əlaqədar nəzərə çarpır.

İkinci, feli sifətlər bu şəkildə daha çox mürəkkəb sözlərin yaranmasına xidmət edir, əksərən isə substantivləşirlər. Nəhayət, onların quruluşu onu deməyə əsas verir ki, bu növ mürəkkəb sözlər اضافه مقلوب (ezafe-ye məqlub) durlar. Yəni, izafət şəkilli söz birləşmələrinin tərəflərinin yeri dəyişilərək mürəkkəb sözə çevrilmişlər. Onların bir neçəsinə diqqət edək:

فروشندهء گوهر - گوهرفروش- gövhər satan
چينندهء خوشه – خوشه چين- başaq yığan
فروشندهء جوهر – جوهرفروش - inci satan
خورندهء ميوه – ميوه خور - meyvə yeyən
شويندهء عيب – عيب شوى -eyib yuyan
جويندهء عيب – عيب جو - eyib axtaran
خواهندهء عذر – عذرخواه - üzr istəyən
خوانندهء آفرين – آفرين خوان -afərin deyən
گردندهء جهان – جهان گرد -dünyanı gəzən
شناسندهء معنى – معنى شناس -məna bilən
پذيرندهء گزارش – گزارش پذير - peyğam qəbul edən
گيرندهء دست – دستگير- əl tutan

Bu sözlər, Nizami dilində isimləşərək, bu nitq hissəsinin bütün kateqoriyalarını qəbul edir, ياى مصدرى (ya-ye məsdəri) vasitəsilə yeni mənalı dil vahidləri yaradırlar. Məs.:

زمردم كشى ترس باشد بسى      زمردم خورى چون نترسد كسى(۸۹, ۸۷)

İnsan qırğınından qorxu çoxdur. Adam, hannibalizmdən necə qorxmasın!?

برآراست برجنگ زنگى بسيچ      بزنگى كشى نيزه راداد پيچ(۹۶, ۱۸۸)

Zənci döyüşünə silahlandı, zənci ölümünə nizəni köklədi.

Beytlərdəki مردم كشى (mərdomkoşi) - adam öldürmə, مردم خورى (mərdomxori) - adamyemə, زنگى كشى (zəngikoşi) - zənci öldürmə və bunlar kimi minlərlə belə sözlərin etimologiyası deyilənlərə misaldır.

Qeyd etmək lazımdır ki, müstəqil sadə feli sifətlərin qısa şəkildə işlənməsi Nizami dilində daha azdır və bu söz qrupları keçmiş zamanda fel əsası və ه (e), indiki zamanda fel kökü və انده (ənde), آن (an), ا (a), gələcək zamanda ى (ya-ye ləyaqət) vasitəsilə formalaşırlar. Odur ki, feli sifətlərin hər biri lüğətdə iki söz maddəsində yerləşdirilmişdir. Birincidə feli sifət, ikincidə onu əmələ gətirən şəkilçi. Söz maddəsində feli sifətin hansı nitq hissəsini ifadə etdiyi göstərilmişdir. Məs.:

خرامنده كبک ظفر يافته      پريداز بر كبک بر تافته(۱۲۱, ۵۰)

Qələbə çalmış kəklik, məğlub kəkliyin yanından məmnun uçdu.



Beytdə, indiki zaman feli sifəti خرامنده (xoramənde) tərzi-hərəkət zərfi rolunda işlənmiş, başqa sözlə adverbiallaşmışdır. Onun söz maddəsi belədir:

خرامنده (xoramənde) - zərflik...beyt
انده (ənde) - İndiki zaman feli sifəti düzəldən şəkilçi...beyt

شناسندگان سرانجام كار      دعاتازه كردندبرشهريار(۱۲۳, ۸۰)

Nəhayət, bilənlər, şəhriyara yenidən dua etdilər ...
شناسنده (şenasənde) -isim...beyt

Həmin sözə daha iki lüğət maddəsi yazılır. Bunlar انده və آن - dan ibarətdir. Və ya:

درآن بزم آراسته چون بهشت      گل افشانتر ازماه ارديبهشت(۱۳۰, ۲۲)

Behişt kimi bəzənmiş o məclisdə gül, ordibeheşt (aprel) ayında olduğundan da parlaq idi.

Yuxarıdakı beytində iki feli sifət işlənmişdir:
آراسته (araste) - keç. zam. feli sifəti...beyt
ه(e) - keç. zam. feli sifəti düzəldən şəkilçi...beyt
گل افشان (qoləfşan) - ind. zam. feli sifəti...beyt.
آن (an) - ind. zam. feli sifəti əmələ gətirən şəkilçi...beyt. Və ya:

زرومى سوارى توانا وچست      برآن آتش افكندخود را نخست(۹۶،۱۷۹)

Əvvəl, rumlardan bacarıqlı və cəld bir süvari özünü o atəşə atdı.

Beytdəki توانا (təvana) indiki zaman feli sifətinə aşağıdakı söz maddələri yazılır.

توانا (təvana) - ind. zam. feli sifəti...beyt
ا (a) - ind. zam. feli sifəti əmələ gətirən şəkilçi

İndi, gələcək zaman feli sifətlərinin Nizami dilində işlənməsinə aid misallara müraciət edək:

زبان چون زگرمى برآشفته شد      سخنهاى ناگفتنى گفته شد(۱۳۱،۳۴)

Elə ki, dil qəzəbdən coşdu, deyilməyəcək sözlər deyilmiş oldu.

ناگفتنى (naqoftəni) beytdə gələcək zaman feli sifətidir, ona aid söz maddələrindən biri ناگفتنى, ikincisi ى (ya-ye ləyaqət) - dir.

Nizami əsərlərinin, o cümlədən «Şərəfnamə»nin leksik tərkibinin zənginliyinin bir amili də orada feli sifət tərkiblərinin geniş şəkildə işlənməsidir. Belə tərkibləri lüğətdə yerləşdirmək üçün oradakı özəl sözü müəyyənləşdirmək lazımdır. Məsələn, burada işlənən və feli sifət tərkibləri kimi formalaşan aşağıdakı poetik ifadələrin yerləşdirildiyi lüğət maddələrinə diqqət edək:

ترنج – روى شسته ترنج ( ruyşoste toronc) - üzünü yumuş narınc
شاه – شاه گيتى فروز (şah-e gitiforuz) - dünyanı işıqlandıran şah
ساقى - ساقى صبحخيز (saqi-ye sobhxiz) - səhər tezdən yuxudan duran saqi

طاوس مشرق خرام – طاوس (tavus-e məşreğxoram) - Məşriqdə gəzən tovuz

«Günəş» mənasında işlənən yuxarıdakı feli sifət tərkiblərindəki özəl sözlər, onların yanında göstərilmiş və lüğətdə, həmin dil vahidlərinin maddələrinin içərisində, müvafiq yerdə yerləşdirilmişdir. Məs.:

طاوس (tavus) - tovuz. Quş növü...طاوس مشرق خرام (tavus-e məşreğ-xoram) - Günəş.

دگرروزکان روی شسته ترنج　　　چون ریحانیان سربرون زد زکنج(۱۷۳, ۹۷)

Səhərisi gün üzünü yumuş narınc reyhan satanlar kimi küncdən çıxanda

9. Qeyd etmək lazımdır ki, fars dilinin müxtəlif növ lüğətlərində felin cümlədə tamamlıqları idarə etmək xüsusiyyətinin əks olunması da leksikoqrafın qarşısında duran mühüm vəzifələrdən hesab olunur. Odur ki, Nizaminin «Şərəfnamə» əsərinin bu lüğətində də həmin cəhət unudulmamış, yeri gəldikcə, bu qrammatik əlaqəni vermək üçün feldən sonra, onun bu cəhətini göstərmək məqsədilə qeydlər aparılmışdır. Əlbəttə, burada ədəbi fars dili ilə Nizami dilinin arasında təbii ki, bu cəhətin özünə məxsus fərqli xüsusiyyətləri ortaya çıxmamış deyildir. Belə ki, bu fərqli xüsusiyyətlər fellərin idarə üsulunun lüğətdə əks olunma işində daha çox diqqət tələb edir.

Klassik fars dilində, o cümlədən Nizami əsərlərində fellərin tamamlıqları idarə vasitələri( önqoşmalar və sonqoşma və s. ) tez-tez öz funksiyalarını dəyişir və burada normativ vasitə tapmaq, onun əsasında işləmək mümkün deyildir. Odur ki, bu işin icrası fərdi şəkildə, Nizami dilinin materialları əsasında aparılmış, başlıca meyar kimi mətnin məzmunu götürülmüşdür.

پرکردن (ازچیزی) (por kərdən( əz çizi)) - doldurmaq (nə iləsə)

هم ازززکانی هم ازلعل ودر　　　بسی چرم وقنطار هاکرده پر(۱۱۱, ۷۲)

Çoxlu dəri kisə və qantarları(iri tərəziləri) doldurmuş həm mədən qızılı, həm də ləl və dürr...

10. Bir qrup lüğət maddələri də modal felləri əhatə edir. Çünki, ədəbi fars dilində olduğu kimi, Nizami əsərlərində də bir sıra fellər öz leksik mənalarından əlavə modallıq bildirmək üçün işlədilirlər ki, onlar fars dili qrammatikasında leksik qrammatik funksiyalarına görə belə qruplaşmışlar:

افعال ارادی (əf'al-e eradi) - arzu, istək modallığı ifadə edən fellər: خواستن ، آرزو داشتن،میل داشتن

افعال اقتداری (əf'al-e eğtedari) - bacarıq modallığı ifadə edən fellər: توانستن، دانستن، یارستن



افعال احتمالی (əf'al-e ehtemali) - ehtimal modallığı ifadə edən fellər: احتمال کردن،گمان کردن

افعال واجبی (əf. al- vacebi) - vaciblik modallığı ifadə edən fellər: بایستن، لازم بودن، واجب شدن

Bu fellərin modallıq ifadə etmə xüsusiyyətlərini göstərmək vacib olduğundan lüğətdə belə söz maddələrinin verilməsi zərurəti yaranmışdır. Məs.:

توانستن (təvanestən) - felin iltizam formasında işlənən bacarıq mənalı modal fel

که خرگوش هرمرزرابی شکفت　　　سگ آنولایت تواندگرفت(۱۷۴, ۱۱۶)

Təbii ki, hər bir ölkənin dovşanını o vilayətin iti tuta bilər.

دانستن (danestən) - felin bacarıq formasında işlənən modal fel

شکردانم ازهرلب انگیختن　　　گلابی زهردیده ریختن(۳۴, ۵۳)

Dodaqları güldürə, gözləri ağlada bilərəm

Köməkçi nitq hissələri leksik mənaya malik olmadıqlarından lüğətdə onların qrammatik funksiaları verilir, işləndikləri beytlərlə təsdiq olunurlar.

Lüğətdə dil vahidlərinin tələffüzü, onların hər birindən sonra latın qrafikası ilə verilir. Azərbaycan və fars dillərinin orfoepiyasında, məlum olduğu kimi eynilik mövcuddur, amma, burada onu nəzərə çatdırmaq lazımdır ki, fars dilində گ (qaf) hərfi özündən sonra gələn saitlərin qalın və incəliyindən asılı olaraq həm «g», həm də «q» kimi tələffüz olunur. Bu hərfin göstərilən cəhəti lüğətdə öz əksini tapır. Bu cəhəti əks etdirən söz maddələrinə nəzər yetirək:

گلاب (qolab) - gülab.

شکردانم ازهرلب انگیختن　　　گلابی زهردیده ریختن(۳۴, ۵۳)

Beytdə işlənən «گلاب» sözündə «گ» hərfindən sonra işlənən qalın «o» səsi onun «q» kimi tələffüz olunmasına səbəb olmuşdur. «گ» hərfi, fars dilində «a» və «u »dan əvvəl işlənəndə də «q»kimi tələffüz olunur. Məs.:

چوفتح سکندردرآمدبکار　　　دگرگونه شدگردش روزگار(۶۵, ۱۵)

İskəndərin fəthi başa çatcaq, dövranın gərdişi dəyişdi. Beytdə «گ » hərfinin özündən sonrakı saitlərin qalın və incəliyindən asılı olaraq tələffüz müxtəlifliyinə diqqət edək:

Ço fəth-e sekəndər dər aməd be-kar, degər qune şod gərdeş-e ruz(e)qar.

Beytlərdən də göründüyü kimi, «گ» hərfi incə «ə» səsindən sonra «g» kimi tələffüz olunur ki, onun belə səslənməsi «e», «i» saitlərindən əvvəl də müşahidə olunur. Məs.:

چوزنگی درآمد بزنگانه رود    زشهرود رومی برآمد سرود(۱۱۰, ۵۵)
نبردآزمایان ایرانسپاه    گرفتند بسرلشگرروم راه(۱۷۲, ۸۸)

Beytlərdəki زنگی (zəngi) və گرفتند (gereftənd) sözləri deyilənlərə misaldır.

Qeyd etmək lazımdır ki, qədim, orta və müasir fars dili lüğətlərində əyani vasitələrdən çox geniş şəkildə istifadə olunmuşdur. Müxtəlif dövrlərdə yaşamüş klassik farsdilli şairlərin poetik irsindən götürülmüş bu əyani vasitələr lüğət maddələrində izah olunmuş sözlərin mənalarına və onların fonetik xüsusiyyətlərinə şahidlik edirlər. Nizami dilinin oxuculara təqdim olunan bu lüğətində fars dili leksikologiyasının ənənəsindən istifadə edilmiş, sözlərin orfoqrafiyası və mənalarını əyani göstərmək üçün “Şərəfnamə” məsnəvisinin 1947-ci ildə Bakıda nəşr olunmuş elmi- tənqidi mətnindən beytlər verilmişdir. Lüğət maddələrinin hamısının sonunda verilmiş farsca beytdən sonrakı ilk rəqəm adı çəkilən məsnəvinin səhifəsinin, ikinci, beytin sayının nömrəsini göstərir.



**ا (əlif) - Fars əlifbasının birinci hərfi**

آ (a) - Xitab bildirir

که شاها خدیواجهانداورا    خردمندخویاخردیاورا(۴۴۹, ۵۳۳)

آ (a) - sözdüzəldici şəkilçidir

پذیراسخن بودشدجایگیر    سخن کزدل آیدبود دلپذیر(۴۲, ۳۶)

آ (a) - Xəbər şəkilçisidir. III ş. təkdə işlənir

خوشاروزگاراکه داردکسی    که بازارحرصش نباشدبسی(۶۹, ۳)

آ ( a ) - cəm şəkilçisidir

بساماهیاکوشودخوردمور    چودرخاک شورافتدازآب شور(۱۸۸, ۱۹۱

آ (a) - bəzi fel formalarında işlənib müəyyən emosi; a bildirir

ببیغاره گفتابیاورپیام    پیام آورازبند بگشاد کام(۱۳۵, ۸۵)

آ (a) - آمدن felinin köküdür

چنان گرم کن عزم رایم بتو    که خرم دل آیم چوآیم بتو(۷, ۶۹)

آب ( ab) -su

تويي که آفریدی زیک قطره آب    گهرهای روشنترازآفتاب(۳, ۸)

آب گلگون (ab-e qolqun) - al şərab

چوسرمست گشت ازگوارنده می    گل از آب گلگون برآورد خوی(۴۶۰, ۶۲)

آب جگر(ab-e cegər) - qan

سنان کش يكي نيزهء سي ارش    باب جگریافته پرورش(۱۰۷, ۱۱)

آب آتشخیال(ab-e atəşxəyal) - mey

بیا ساقی آن آب آتشخیال    درافکن بدان کهرباگون سفال(۴۶۲, ۱)

آب حیوان(ab-e heyvan) - dirilik suyu

لب ازباد عیسی پر ازنوشتر    تن ازآب حیوان سیه پوشتر(۱۳, ۱۰)

آب حیوان (ab-e heyvan) - İskəndər

ندارچومن خاكي آن دسترس    که با آب حیوان برآردنفس(۴۴۵, ۴۹۰)

آب روان(ab-e rəvan) - behiştdə axan su

درآمد بمشکوی مشگین سرشت          چوآب روان کاید اندربهشت(۲۱۷, ۳۷)

آب زر(ab-e zər) - qızıl su

باب زراین نکته باید نوشت          شتربان درود آنچه خربنده کشت(۲۱۸, ۵۶)

آب سرخ(ab-e sorx) - qırmızı şərab

من وآب سرخ و سرسبز شاه          جهان گو فرو شوبه آب سیا ه

آب گردنده (ab-e gərdənde) - göy, fələk

پیغمبربدان ختلی ره نورد          بر آورد ازاین آب گردنده گرد(۱۶, ۲۰)

آب گلرنگ (ab-e golrəng) - al şərab

نیوشنده شد نالهء چنگ را          بکف برنهادآب گلرنگ را(۴۴۲, ۴۳۰)

آب نار (ab-e nar) - şərab

ازآن نارون تا بوقت بهار          گهی نار خواهد گهی آب نار(۲۱۵, ۵)

آب و خاک (ab-o-xak) -hava, iqlim

جهاندارچون دید کان آب وخاک          ز پوینده اسبان بر آرد هلاک(۳۴۰, ۱۶)

آب و رنگ (ab-o-rəng) -sağlamlıq, təravət

ولکن آشتی به ز پرخاش وجنگ          که این دردوداغ آردآن آب و رنگ(۳۵۸, ۶۳)

آب و رنگ دادن (ab-o-rəng dadən) -təravətləndirmək, əhvalı yaxşılaşdırmaq

بده تا مگرچون در آید به چنگ          دهدرنگ وآبش مرا آب و رنگ(۴۵۱, ۲)

زآب و رنگ شدن (ze ab-o-rəng şodən) - solmaq, təravətini itirmək

رقمهای رومی نشد زاب و رنگ          باییناء چینی افتادزنگ(۳۷۸, ۳۶)

آب خوردن (ab xordən) - səbr etmək, ləngimək(suiçim qədər)

زپیوند آزرم چون بگذرم          مباد آبم ار باکسی آبی خورم(۳۵۲, ۵۰)

آب نخوردن (ab nəxordən) - tələsmək

چو پرخون شداین طشت زرین چه کرد          بخوردش چو آبی و آبی نخورد(۸۶, ۴۲)

آب ریختن (ab rixtən) - yağdırmaq(yağış)

ازآن ابرعاصی چنان ریزم آب          که ناردگردست برآفتاب(۱۵۰, ۹۹)



آب زدن (ab zədən) - sulamaq, su səpmək

چو سقای باران و فراش باد          زدندآب ورفتند ره بامداد(۱۱۳, ۱۸)

آب دردیده (ab dər dide) - ağlar

کسانیکه بودند با اوبراه          شدندآب دردیده نزدیک شاه(۸۶, ۴۳)

آب در دیده نداشتن (ab dər dide nədaştən ) - utanmamaq, həyasızlıq etmək

یزک بریزک سو بسودر شتاب          نه در دل سکونت نه در دیده آب(۱۶۷, ۱۲)

آب درچشمهء آتش افکندن (ab dər çeşme-ye ataş əfkəndən) – su səpmək, günəşi söndürmək

اگرسایه بر آفتاب افکند          درآن چشمهء آتش آب افکند(۴۷, ۱۸)

آب(چیزی را، کسی را)بردن (ab-e(çizi ra, kəsi ra) bordən) - şöhrətdən salmaq, abrını aparmaq

روان کرد کلک شبه رنگ را          ببرد آب مانی وارژنگ را(۱۵۴, ۱۵۷)

آب (چیزی را، کسی را) ریختن (ab-e(çizi ra, kəsi ra) rixtən) - abrını tökmək, şan-şöhrətini əlindən almaq

رخی چون گل وآب گل ریخته          میان لاغر و سینه انگیخته(۲۲۴, ۱۲۶)

آب و آتش بودن (ab-o-ataş budən) - su ilə od olmaq, əks mövqelərdə olmaq

چو بوداز جوانی وگردنکشی          هم آن جانب آبی هم این آتشی(۱۶۸, ۱۶)

آب ورنگ بچهره درآوردن (ab-o-rəng be-çehre dər avərdən) – güclənmək, rəng-rufa gəlmək, sevincdən üzü ğülmək

شه ازنصرت مصروتاراج زنگ          بچهره درآورده بود آب ورنگ(۱۲۰, ۲۹)

آب و رنگ دادن (ab-o-rəng dadən) - gücləndirmək, rəng-ruf vermək

بده تامگرچون در آید بچنگ          دهد رنگ وآبش مراآب و رنگ(۴۵۱, ۲)

آب در روی کارآوردن (ab dər ru-ye kar avərdən) - işi qaydasına qoymaq

میی کاب در روی کار آورد    نه آن می که در سر خمار آورد(۳۹۲, ۲)

آب بزیر هشتن (ab be-zir heştən) - aldatmaq

بجایی نخسبدعقاب دلیر    که آبی توان هشتن اورابزیر(۳۲۷, ۳۵)

از آب دریاگرد بر آوردن (əz ab-e dərya gərd bər avərdən) - sudan toz çıxarmaq, düşmən qoşununa divan tutmuq, düşmən qoşununun külünü göyə sovurmaq

پراکندهء چند را گرد کرد    که از آب دریابرآرند گرد(۳۱۸, ۲۹)

باب دادن (be-ab dadən) - boğmaq, həlak etmək

چودریابتلخی جوابش دهم    ز خاکش ستانم بابش دهم(۱۵۰, ۹۸)

باب مژه روی رارود کردن (be-ab-e moje ruy-ra rud kərdən) - ağlamaq

جهانجوی راترک بدرود کرد    باب مژه روی رارود کرد(۳۹۱, ۱۴۱)

آب (ab) - çay, dəniz, bulaq

فراخی گهی بودنزدیک آب    فرودآمدآنجابهنگام خواب(۴۰۴, ۱۵)

آب (ab) - parlaq

حمایل یکی تیغ هندی چو آب    بگوهرتراز خنجر آفتاب(۱۰۷, ۱۲)

آب (ab) - lətafətli, mülayim

نگاری بدان خوبی و دلکشی    بگوهر هم آبی وهم آتشی(۳۳۷, ۶۰)

آب (ab) - abır, həya آبرو sözünün muxəffəfi

ولیکن نگهدارم آزرم وآب    ز پوشیدگان بر ندارم نقاب(۳۶۵, ۱۶۵)

آب (ab) - musiqi səsi

سکندرز مستی شده نیمخواب    روان آب درچنگ و چنگی چوآب(۲۸۰, ۶۴)

آب (ab) - hovuz

چودرخاک چین این خبر گشت فاش    که مانی بر آب زد دورباش(۳۸۰, ۵۹)

آبا (aba) - ata-baba, əcdad

کرایارگی کز سرگفت وگوی    زماجای آباکند جست و جوی( ۱۵۰, ۹۲)



ابا (əba) - yemək, aş

اباهای نوشین عنبرسرشت    خبرداده ازخوردهای بهشت(۲۶۷, ۲۴۶)

آباد (abad) - abadlıq

درآبادوویران نشست آورم    همه ملک عالم بدست آورم(۲۸۳, ۲۵)

آباد (abad) - afərin

که آباد برچون توشاه دلیر    که پیغام خود خود گزاردچو شیر(۲۵۸, ۱۳۶)

آباد (abad) - abad

درآن بوم آبادوجای مهان    زمانه بسي گنج دارد نهان(۲۵۰, ۲۰)

آباد (abad) - möhkəm

زقلبی که چون کوه پولاد بود    پناهنده را قلعه آبادبود(۱۶۹, ۳۵)

آباد بودن (abad budən) - abad olmaq

ثناگفت برگاه وبر بزم شاه    که آبادبادازتواین بزمگاه(۱۴۵, ۳۱)

آبادکردن (abad kərdən) - abadlaşdırmaq, bərpa etmək, yenidən tikmək

بناهای ویرانه آباد کرد    بسی شهرنونیزبنیادکرد(۳۹۱, ۱۴۹)

آباد کشتی شدن (abadkəşti şodən) - xilas olmaq, gəmisi saz olmaq

مگرزآن می آبادکشتی شوم    و گر غرقه گردم بهشتی شوم(۶۹, ۲)

آباد گردیدن (abad gərdidən) - müəssər olmaq, tapmaq, əldə etmək

درین عالم آباد گردد بگنج    در آن عالم آزادگرددزرنج(۶, ۵۲)

**آبادبوم** (abadbum) –abad ölkə

زهندوستان تابیابان روم    زویران زمین تا بابادبوم(۲۶۲, ۱۹۴)

**آبادی** (abadi) - abadlaşma, abadlaşdırma

درآبادی راه میبردرنج    برآنریگ چون ریگ میریخت گنج(۴۵, ۳۶)

**آبادی** (abadi) -abadlıq, sahman

شکسته چنان گشته ام بلکه خرد    که آبادیم راهمه باد برد(۸, ۸۰)

**بابادی افتادن** ( be-abadi oftadən) - abadlaşmaq

جهان بود چون کان جهان خراب    بابادی افتاد ازین آفتاب(۴۸, ۳۶)

**بابادی آوردن** (be-abadi avərdən) - abadlaşdırmaq

جهانراز ویرانی عهدپیش    بابادی آورد در عهدخویش(۲۰۵, ۲۰۲)

**آبجوی** (abcuy) - bulaq suyu ( mey)

بیا ساقی آن آبجوی بهشت    درافکن بدانجام آتش سرشت(۲۱۵, ۱)

**ابخاز** (əbxaz) - Abxaziya

در ابخازکردیست عادی نژاد    که از رزم رستم نیارد بیاد(۲۴۵, ۶۸)

**ابخازی** (əbxazi) - abxaziyalı

وزانجاشبیخون بر ابخاز کرد    در کین بر ابخازیان باز کرد(۲۴۵, ۷۶)

**آبخورد** (abxord) - bulaq, çeşmə

روان آب درسبزه آبخورد    چو سیماب در پیکرلاجورد(۳۴۱, ۳۰)

آبخورد کردن (abxord kərdən) - dayanmaq, mənzil etmək

شه عالم آهنج گیتی نورد    درآن خاک یکماه کردآبخورد(۳۴۴, ۶۳)

**ابد** (əbəd) - əbədi

گروکن بعمر ابدجا مرا    گروگیر کن باده‌ء خام را(۱۱۹, ۲۲)

**ابد**( əbəd) - son, əbədiyyət

خردتا ابدرنیابدترا    که تاب خرد بر نتابد ترا(۵, ۲۴)

آبدار (abdar) - parlaq

قبایی زره بر تنش تابدار    چو سیماب روشن چوسیم آبدار(۴۲۳, ۱۶۵)

آبدار (abdar) - əla növ

مرصع بسی تیغ گوهرنگار    نمطهای زرافه آبدار(۱۱۶, ۵۸)

ابر (əbr) - saç

از آن مشگبرابر گل ریخته    مه ازسنبله سنبل آویخته(۳۳۶, ۵۳)

ابر (əbr) - bulud

چو دریا چرا ترسم از قطره دزد    که ابرم دهد بیش ازآن دست مزد (۲۲, ۳)

بارانی خودرازدوش افکندن ابر (barani-ye xod-ra ze duş əfkəndən-e əbr)



– buludun dağılması

ز بس تیرباران که آمد بجوش    فکند ابر بارانی خود از دوش(۱۷۹, ۵۹)

زکوه بر آمدن ابر کافوربار (ze kuh bər amədən-e əbr-e kafurbar) – saçın ağarması, qocalmaq

برآمدزکوه ابرکافوربار    مزاج زمین کافورخوار(۲۷, ۳۶)

ابرظلمترنگ (əbr-e zolmətrəng) - vəhşi döyüşçü

در آمد یکی ابرظلمترنگ    برآن سنگساران ببارید سنگ(۴۴۷, ۵۱۵)

با ابروآفتاب ستیزیدن (ba əbr-o-aftab setizidən) – çətinliklə qarşılaşmaq

چهل روزباشدکه بیخوردوخواب    ستیزیم با ابر وبا آفتاب(۲۹۱, ۴۷)

ابرش ( əbrəş ) - üstü xallı at

زین بر ابرش نهادن شاه چین (zin bər əbrəş nəhadən-e şah-e çin) – günəşin çıxması

که چون شاه چین زین بر ابرش نهاد    فلک نعل زنگی بر آتش نهاد(۸۴, ۱۳)

ابرو (əbru) - qaş

کمندی چو ابروی طمغاچیان    بخم چون کمان گوشه‌ءچاچیان(۹۷, ۱۹۲)

ابروگشادن (əbru qoşadən) - gülmək, lütfkarlıq etmək

شه کاردان مجلسی نو نهاد    سرانرا طلب کرد وابروگشاد(۲۹۱, ۴۳)

ابروگره زدن (əbrugereh zədən) - üz qırışdırmaq, kin bəsləmək

کسی کوزندبر من ابروگره    کفن به که پوشد بجای زره(۴۲۷, ۲۱۷)

ابرورا گره بر زدن (əbru-ra gereh bər zədən) - qaşlarını çatmaq

گره بر زد ابروی پیوسته را    گشاد ازگره چشم در بسته را(۱۴۷, ۶۴)

ابروی گشادن (əbruy qoşadən) - şadlandırmaq, şənləndirmək

نشاط ابروی می پرستان گشاد    ز نیروی می روی مستان گشاد(۲۷۳, ۳۲۶)

بابروکمانکش (be-əbru kəmankəş) - kaman qaşlı

بدیدن همایون ببالا بلند    بابروکمانکش بگیسوکمند(۶۶, ۴۰)

بابرو درچین زدن (be-əbru dər çin zədən) – qorxuya salmaq

بفرمود تاکوس روئین زدند بابرودرازچینیان چین زدند(۳۷۱, ۲۵۱)

بابروشکنج بر زدن (be-əbru şekənc bər zədən) - qaşlarını çatmaq

بگفت این وبرزدبابرو شکنج چو ماری که پیچد ز سودای گنج(۹۶, ۱۷۸)

بابروگره بر زدن (be-əbru gereh bər zədən) - qaşa düyün vurmaq

کمانم چو بر زدبابروگره شه چین کمانرا فرو کرد ز ره(۴۰۹, ۸۵)

بابرو گره در آوردن (be-əbru gereh dər avərdən) - xoşa gəlməmək, qəzəbləndirmək

سخن کان بابرودرآردگره اگر آفرینست ناگفته به(۲۳۲, ۸۵)

از ابرو گره بر گوشه نهادن (əz əbru gereh bər quşe nəhadən) – kefini kök etmək

گره ز ابروی خویش بر گوشه نه که بر گوشه بهترکمانرا گره(۱۵۳, ۱۴۴)

**ابرو فراخ** (əbrufərax) - geniş qaşlı, qələmqaş

دهن تنگ وسرگردوابروفراخ رخی چون گل سرخ بر سبزشاخ(۴۸،۳۳۶)

**ابریشم** (əbrişəm) - ipək

چو ازشاخ بستان کند طوق وتاج نه ز ابریشمش یاد باشد نه عاج(۳۰۷, ۱۰۰)

**آبستن** (abestən) - hamilə

ضمیرم نه زن بلکه آتشزن است که مریم صفت بکرآبستنست(۳۶, ۸۹)

بنیک و بدآبستن بودن (be-nik-o-bəd abestən budən) - əlindən yaxşılıq və pislik gəlmək

زمانه بنیک وبدآبستنست ستاره گهی دوست گه دشمنست(۳۱۸, ۲۲)

**آبستنی** (abestəni) - hamiləlik

چونه ماه برآمدبرآبستنی بجنبش درآمدرگ رستنی(۶۷, ۴۷)

**آبستنی** (abestəni) - doğum

بابستنی روزبیچاره گشت زشهر وزشوی خودآواره گشت(۶۵, ۱۹)

**آبگیر** (abgir) - hovuz, göl



دهن ناگشاده لب آبگیر که آمدلب سبزه را بوی شیر(۲۷۶, ۱۹)

**آبگین** (abgin) - şərab

چو درجام کیخسروآبی نماند بجای آبگینش نبایدفشاند(۳۰۸, ۱۱۲)

**آبگینه** (abgine) - şüşə, badə

مزن سنگ بر آبگینه نخست که چون بشکند دیر گرددد‌رست(۳۶۲, ۱۱۶)

**ابلق** (əbləğ) - ağ-qara rəngli, ala-bula (Zəngibarla İran)

سیاهی گرفتی سپیدی بگیر چنین ابلقی بایدت ناگزیر(۱۲۰, ۲۷)

**ابله** (əbləh) -axmaq, ağılsız

شنیدم نه از زیرکی ز ابلهی که زرزرکشد چون برابر نهی(۲۳, ۱۱)

**آبله** (abele) - qabar, yara

آبله شدن (abele şodən) - qabarmaq, qabar olmaq

ز بس خستهء تیرپیکان نشان شده آبله دست پیکان کشان(۱۷۰, ۵۰)

آبله در پای کسی ریختن (abele dər pa-ye kəsi rixtən) - ayaqdan salmaq, təhlükə yaratmaq

بپیکان ترکان این مرحله توان ریخت درپای روس آبله(۴۱۰, ۸۹)

**ابنا** (əbna) - nəsil

چنان کن که این عهد نیکونمای در ابنای مادیرماند بجای(۳۳۳, ۱۴)

**آبنوس** (abnus) - qara ağac, qarağac

دولشگربهم بر کشیدندکوس چو شطرنجی از عاج واز آبنوس(۱۰۶, ۲)

**آبنوس** (abnus) - qara bədən

زهندوزنی خانه پرخون شده همه آبنوسش طبرخون شده(۲۷۷, ۳۳)

آبنوسی درخت (abnusi derəxt) - zənci

بیک زخم آن گرز پولادلخت ستدجان از آن آبنوسی درخت(۹۸, ۲۱۲)

آبنوسی شدن (abnusi şodən) - qaralmaq

شداز زخمه کاسه وزخم کوس خدنگ اندران بیشه هاآبنوس(۲۹۸, ۱۳۷)

**آت** (at) - ərəb cəm şəkilçisi

فی المناجات(۱۰)

**آتش** (atəş) - atəş, od

چوشمع آتش افتاده در باغ من    شده باغ من اتشین داغ من(۲۱, ۱۴)

آتش توبه سوز (atəş-e toubesuz) - şərab

بیاساقی آن آتش توبه سوز    باتشگه مغز من بر افروز(۱۴۳, ۱)

آتش روز (atəş-e ruz) - günəş

که چون آتش روز روشن گذشت    پراز دود شدگنبد تیزگشت(۱۷۶, ۱۱)

آتش زندسوز (atəş-e zəndsuz) - İskəndər

بدین زندگی آتش زندسوز    برافروخته شاه گیتی فروز(۲۷۸, ۴۹)

آتش افروختن (atəş əfruxtən) - 1. ocaq yandırmaq, od yandırmaq

عقیق از شبه آتش افروخته    شبه گشته ز آتش سیه سوخته(۱۰۹, ۴۵)

آتش افروختن (atəş əfruxtən) - 2. hirslənmək, qəzəblənmək

درآن تندی واتش افروختن    کزو خواست مغزسخن سوختن(۱۵۴, ۱۵۴)

آتش فروختن (atəş foruxtən) - bax:    آتش افروختن-۱

بفرمود شاه آتش افروختن    برسم مغان بوی خوش سوختن(۲۷۴, ۳۴۳)

آتش انگیختن (atəş əngixtən) - od çıxarmaq

چوبر اب دریا غضب ریختی    ز دریای آب آتش انگیختی(۱۷۱, ۶۱)

آتش بر افروختن (atəş bər əfruxtən) - alovlanmaq

مگر چون بر افروزدآتش زجام    شود کارما پخته زان خون خام(۲۷۳, ۳۳۲)

آتش برانگیختن (atəş bər əngixtən) - od vurmaq

که آتش زدشمن بر انگیختم    باقبال شه خون اوریختم(۱۸۲, ۹۴)

آتش درآب انگیختن (atəş dər ab əngixtən) - qan tökmək, qiyamət qoparmaq

چوبرجوشم از خشم چون تند میغ    درآب آتش انگیزم ازدود تیغ(۲۶۲, ۱۸۴)

آتش زدن (atəş zədən) - 1. alovlanmaq, yanmaq

چوآوازبر پیل سرکش زدی    زدی آتش ارخود بر آتش زدی(۹۴, ۱۵۲)

آتش زدن (atəş zədən) - 2. od vurmaq, yandırmaq



برون آید از روم گردنکشی    زند در هرآتشکده آتشی(۱۴۵, ۳۶)

آتش بر فروختن (atəş bər foruxtən) - bax:آتش بر افروختن

زباده چنان آتش بر فروخت    که میخوارگانرادرآن رخت سوخت(۲۷۴, ۳۴۴)

آتش در زدن (atəş dər zədən) - od vurmaq

بهندوستان در زنم آتشی    نمانم در آن بوم گردنکشی(۳۳۳, ۸)

آتش در(چیزی، کسی) انگیختن (atəş dər(çizi, kəsi, əngixtən) – od çıxarmaq, od vurmaq

چو بر جوشم از خشم چون تند میغ    در آب آتش انگیزم از دود تیغ(۲۶۲, ۱۸۴)

آتش از موم فروزنده گردد (atəş əz mum foruzənde gərdəd) - atəş mumdan alovlanar

بیائیدیک لشگرازچین و روم    که آتش فروزنده گرددزموم(۴۱۵, ۵۶)

آتش ز دریای آ ب برانگیختن چشمهء آفتاب (atəş ze dərya-ye ab bər əngixtən-e çeşme-ye aftab) - günəşin çıxması

چوروز دگر چشمهء آفتاب    بر انگیخت آتش ز دریای آب(۱۰۶, ۱)

آتش طیرگی را ز جوش نشاندن (atəş-e tirəgi ra ze-cuş neşandən) – hirsini soyutmaq

چولختی منش را بمالید گوش    نشاند آتش طیرگی رازجوش(۲۶۶, ۲۳۸)

آتش کینه را برفروختن (atəş-e kine-ra bər foruxtən) - düşmənçilik etmək

تو نیزآتش کینه رابرفروز    که فرخ بودآتش کینه سوز(۱۴۰, ۴۸)

آتش گرم را کشتن (atəş-e gərm-ra koştən) - hirsini boğmaq, qəzəbini biruzə verməmək

و لیکن نکشت آتش گرم را    بسر کوچکی داشت آزرم را(۱۴۷, ۶۲)

آتش لعل بر افروختن (atəş-e ləl bər əfruxtən) - məhəbbət odu yandırmaq

مگرکاتشی برفروزند لعل    درآتش نهندازپی شاه نعل(۲۷۴, ۳۴۲)

باتش سپردن (be-atəş sepordən) - yandırmaq

مغانرا باتش سپارندرخت    برآتشکده کار گیرند سخت(۲۰۷, ۱۳)

برآتش آوردن (bər atəş avərdən) - odun üstünə qoymaq

تن بط بود درخورآبگیر    چو بر آتش آری برآردنفیر(۲۷۹, ۵۳)

برآتش انگشت زدن (bər atəş ənqoşt zədən) - müharibə odu dadmaq

سوار هنرمندچابک رکاب    که بر آتش انگشت زد بیحساب(۴۳۷, ۳۶۲)

برآتش نهادن فلک نعل زنگی (bər atəş nəhadən-e fələk nəl-e zəngi) – səhərin açılması

که چون شاه چین زین برابرش نهاد    فلک نعل زنگی بر آتش نهاد(۸۴, ۱۳)

برآتش نشستن (bər atəş neşəstən) - məhv olmaq, yox olmaq

که چون دین دهقان بر آتش نشست    بمرد آتش وسوخت آتشپرست(۲۰۷, ۱۰)

درآتش فشاندن (dər atəş feşandən) - odda yandırmaq

برافرازم ازکوهش اورنگ را    درآتش فشانم همه سنگ را(۳۹۶, ۵۷)

ازآتش چوگل زربدست شدن خار (əz atəş ço gol-e be-dəst zər şodən-e xar) – alovlanıb yanmaq

شده خارازآتش چوگل زربدست    نه چون گل زردشتی آتشپرست(۲۷۷, ۲۶)

**آتش** (atəş) - 2. atəşpərəstlik

چوشاه ازجهان رسم آتش زدود    برآورد ازآتشپرستنده دود(۲۰۹, ۴۳)

**آتش** (atəş) - 3. ehtiras, daxili od-atəş

ز سختی بسختی توان رخت برد    بگوگردونفط آتش کس نمرد(۳۱۷, ۹)

**آتش** (atəş) - 4. tünd, qətiyyətli

نگاری بدان خوبی و دلکشی    بگوهر هم آبی وهم آتشی(۳۳۷, ۶۰)

**آتش** (atəş) - 5. söz

چو کید آنچنان آتش تیزدید    ازورستکاری بپرهیز دید(۳۲۸, ۴۶)

**آتش** (atəş) - 6. hirs, qəzəb

آتش گرم را کشتن (atəş-e gərm-ra koştən) - hirsini soyutmaq, əsəblərini cilovlamaq



و لیکن نکشت آتش گرم را    بسرکوچکی داشت آزرم را(۱۴۷, ۶۲)

**آتش انگیز** (atəşəngiz) - alov, atəş, daxili qızğınlıq

فرو پژمریدآتش انگیزشان    ز گرمی نشست آتش تیزشان(۹۲, ۱۳۰)

**آتش انگیز** (atəşəngiz) - öldürücü, od saçan, odlu

کجا تیغی ازتیغ من تیزتر    زپیکان من آتش انگیزتر(۲۵۸, ۱۲۵)

**آتش پرست** (atəşpərəst) - atəşpərəst, oda sitayiş edən

بجز رسم زردشت آتش پرست    نداد آندگررسمهاراز دست(۵۵, ۳۱)

**آتش پرستی** (atəşpərəsti) - atəşpərəstlik

سکندربفرمودکایرانیان    گشایند از آتشپرستی میان(۲۰۷, ۱۱)

آتشپرستی کردن (atəşpərəsti kərdən) - atəşpərəstlik etmək, oda sitayiş etmək

بارمن درآتشپرستی کنند    دگرشاه رازیردستی کنند(۲۴۵, ۶۷)

**آتشرو** (atəşrou) - atəşsevən, özünü oda vuran

سمندر چوپروانه آتشروست    ولیکن این کهن لنگ وآن خوشروست(۱۸۹, ۱۹۹)

**آتشزن** (atəşzən) - çaxmaq daşı

ضمیرم نه زن بلکه آتشزنست    که مریم صفت بکر آبستنست(۳۶, ۸۹)

**آتشزده** (atəşzəde) - od püskürən

که هست اژدهایی درآتشکده    چو قاروره درمردم آتشزده(۲۱۲, ۷۹)

آتشزده شدن (atəşzəde şodən) - yanmaq

نه آتش گذارم نه آتشکده    شود آتش از دستم آتشزده (۱۶۲, ۳۱)

**آتش سرشت** (atəssereşt) - odlu, odla yoğrulmuş

بیا ساقی آن آبجوی بهشت    درافکن بدانجام آتش سرشت(۲۱۵, ۱)

**آتش فشان** (atəşfeşan) - od saçan

سوی شاه شدداغ بردل کشان    شتابنده چون برق آتش فشان(۱۳۳, ۶۶)

**آتشکده** (atəşkəde) - atəşkədə

برون آید ازروم گردنکشی    زنددرهرآتشکده آتشی(۱۴۵, ۳۶)

**آتش کشی** (atəşkoşi) - od söndürmə

باتش کشی باز مالید گوش     چو پروانه کایدش خون بجوش(۹۶, ۱۸۰)

**آتشگه** (atəşgəh) - atəşgah

بیا ساقی آن آتش توبه سوز     باتشگه مغزمنبرفروز(۱۴۳, ۱)

**آتشی** (atəşi) - hirsli, qəzəbli

آتشی شدن (atəşi şodən) - hirslənmək

جهان خسرو اچند گردنکشی     بر این آب حیوان مشوآتشی(۴۷۱, ۱۳۰)

**آتشین** (atəşin) - odlu

چو دیدند خلق آتشین اژدها     دل خویش کردنداز آتش رها(۲۱۲, ۷۷)

آتشین گشتن (atəşin gəştən) - od saçmaq, işıq saçmaq

زتابنده یاقوت ورخشنده لعل     خرامنده ر اآتشین کشت نعل(۲۵۷, ۱۰۸)

آتشین گشتن) atəşin gəştən) –alovlanmaq

زبس خون که گردآمداندرمغاک     چو گوگردسرخ آتشین گشت خاک(۱۶۹, ۴۲)

آتشین خانهء سختجوش (atəşin xane-ye səxtcuş) - dünya

ازاین آتشین خانهء سختجوش     کسي جان برد کوبود سختکوش(۳۱۷, ۸)

**اتفاق** (ettefağ) - məclis

سپند از خراسان و فوراز عراق     بریشادازارمن بدین اتفاق(۴۰۸, ۷۴)

**اتفاق** (ettefaq) - görüş

یکی گفت کاید گه اتفاق     سرود ازخراسان وروداز عراق(۳۷۶, ۱۲)

اتفاق کردن (ettefaq kərdən) - məsləhətləşmək

زنان سمن سینه سیم ساق     بهرکارباأو کنند اتفاق(۲۵۱, ۴۳)

آتفاق کردن (ettefaq kərdən) - getmək, yollanmaq

دگرره درآمد بملک عراق     سوی خانهء خویش کرداتفاق(۲۴۴, ۶۲)

**اثر** (əsər) - əsər

اثرهای آن شاه آفاق گرد     ندیدم نگاریده در یک نورد(۵۴, ۱۷)

**اجل** (əcəl) - əcəl



سرانجام کاید اجل سوی او     وبال تن او شودموی او(۲۵, ۹)

**احسان** (ehsan) - ehsan

رسد شرق تا غرب از احسان او     بهرخانهء نعمت خوان او(۴۸, ۴۳)

**احکام** (əhkam) - əhkam, qayda-qanun.

زکیخسروآن جام گیتی نمای     که احکام انجم درویافت جای(۵۰, ۶۱)

**احکامکار** (ehkamkar) - işbilən, usta, sənətkar

زخاراتراشان احکامکار     که برکوه دانندبستن حصار(۲۹۸, ۱۳۴)

**احوال** (əhval) - əhval, vəziyyət

ببیعت درآن انجمنگاه بود     ز احوال پیشینه آگاه بود(۱۴۵, ۳۰)

**اختر** (əxtər) - ulduz

بوقت ولادت بفرمود شاه     که دانا کند سوی اختر نگاه(۶۷, ۴۸)

**اختر** (əxtər) - tale

بترسم که اختربدین طیرگی     بداندیش مارادهد چیرگی(۱۳۹, ۳۷)

**اختیار** (extiyar) - müdrik

ازآنجمله حضرت شهریار     بلیناس فرزانه بود اختیار(۲۸۶, ۶۰)

اختیارش آمد (extiyarəş aməd) - ixtiyarında olan

ازآن کارهاکاختیارآمدش     پرستشگری در شمارآمدش(۳۶۳, ۱۲۴)

**اختیار** (extiyar) - icazə

یکی روزکزگردش روزگار     بدست آمدش طالعی اختیار(۱۴۱, ۶۳)

اختیار کردن (extiyar kərdən) - seçmək

یکی روزکرد ازجهان اختیار     فروزنده چون طالع شهریار(۳۸۳, ۱۷)

اختیار داشتن (extiyar daştən) - əhəmiyyət vermək

دگرگفتهاچون عیاری نداشت     سخنگو برآن اختیاری نداشت(۶۶, ۳۷)

**آخر** (axər) - sonda, axırda, nəhayət

وگر گنج پنهان نیارد پدید     شود خرم آخر بزرین کلید(۵۲, ۱۴)

**آخر** (axer) - ertəsi

چوروزآخرصبح ابلق سوار    طویله برون زد برین مرغزار(۱۸۸, ۱۸۳)

**آخر** (axor) - axur

طویله زدند آخرانگیختند    بسبزآخران بر علف ریختند(۳۴۴, ۶۴)

**آخرین** (axerin) - sonuncu

زتست اولین نقش را سرگذشت    بتست آخرین حرف رابازگشت(۷, ۵۷)

**آخستان** (əxsetan) - Əxsitan

اگرشد سهی سروشاه اخستان    توسر سبزبادی درین گلستان(۳۱۰, ۱۸)

**اخلاص** (exlas) - səmimiyyət

بدارا دو سرهنگ بودند خاص    باخلاص نزدیک و دوراز خلاص(۱۷۳, ۱۰۱)

**ادب** (ədəb) - ədəb, mərifət

نظامی چو می باسکندرخوری    نگهدارادب تازخود برخوری(۶۳, ۴۹)

**ادباربخت** (edbarbəxt) - bədbəxtlik

مرا نیزیافت ادباربخت    وگر نه چرا بستم این کار سخت(۴۳۹, ۳۹۴)

**آدم**(adəm) - adam, insan

اساسی که درآسمان وزمیست    باندازهء فکرت آدمیست(۱۱, ۱۷)

آدم صیدجواب خوشست (adəm seyd-e cəvab-e xoşəst) - adam xoş cavabın ovudur

رخ شه برافروخت از خرمی    که صید جواب خوشست آدمی(۲۱۹, ۶۵)

**آدمی پیکر** (adəmipeykər) - insan görkəmli

دروآدمی پیکرانی چنین    بترکیب خاکی بزور آهنین(۴۳۳, ۳۱۳)

**آدمی خوار** (adəmixar) - adamyeyən

همه آدمی خوارومردمگزای    نداردرین داوری مصرپای(۸۰, ۲۴)

**آدمی خواره** (adəmi xare) - adamyeyən

چوآن آدمی خواره یابدخبر    که هست آدمیخوارهءزوبتر(۹۰, ۱۰۳)

**آدمیزاده** (adəmizade) - insan övladı

درآن مسلح آدمیزادگان    زمین گشته کوه از افتادگان(۱۸۰, ۷۴)



**ادهم راندن** (ədhəm randən) - sözü başqa istiqamətə çevirmək

سخن بین کزودور چون مانده ام    کجا بودم ادهم کجارانده ام(۳۵۵, ۱۷)

**ادیم** (ədim) - dəri, gön

چهل روزخود راگرفتم زمام    کادیم از چهل روز گرددتمام(۳۶, ۸۱)

ادیم یمن زیرپای آوردن (ədim-e Yəmən zir-e pay avərdən) - Yəmən torpağına üz qoymaq

چوشرط پرستش بجای آورید    ادیم یمن زیرپای آورید(۲۴۴, ۲۰)

**آذر** (azər) - ataş, od

برخشنده آذرباستاوزند    بخورشیدروشن بچرخ بلند(۱۵۶, ۲۰)

**آذرابادگان** (azərabadeqan) - Azərbaycan

وزانجا بتدبیرآزادگان    درآمد سوی آذرابادگان(۲۱۰, ۶۰)

**آذرپرست** (azərpərəst) - ataşpərəst

دگرگونه دهقان آذرپرست    بدارا کند نسل اوبازبست(۶۶, ۳۳)

**آذرگشسب** (azərqoşəsb) - ataşgədə adıdır

زده موبدش نعل زرین بر اسب    شده نام آن خانه آذرگشسب(۳۲۴, ۱۰۶)

**آذرهمایون** (azərhomayun) - xüsusi ad

درودخترجادواز نسل سام    پدر کرده آذرهمایون نام(۲۱۱, ۷۲)

ار (ər) - اگر -in qısa forması. Şərt bildirir.

گناه من ار نامدی در شمار    ترا نام کی بودی آمرزگار(۶, ۴۴)

آر (ar) - sözdüzəldici şəkilçidir.

بگفتارشه مغز را تر کنم    بگفت کسان مغز در سر کنم(۵۲, ۱۹)

آر (ar) - آوردن felinin kökünün qısa forması

زغیب آن نمودارش آری بدست    کزین غایب آگاه باشد که هست(۷, ۶۶)

آرای (aray) - آراستن felinin kökü

برآرم چراغی ز پروانهء    درختی بر آرایم از دانهء(۲۲, ۲۸)

**آراستن** (arastən) - toplamaq

توزوبیش در لشگر آراستن     خراج از یونان توان خواستن(۱۲۳, ۹۱)

**آراستن** (arastən) - hazırlamaq, qurmaq (məclis)

جداهریکی بزمی آراستی     وزانجابسی فتنه بر خاستی(۲۰۸, ۳۲)

**آراستن** (arastən) - bəzəmək

جهانی بدین خوبی آراستی     برون زانکه یاری گری خواستی(۳, ۱۲)

**آراستن** (arastən) - təmin etmək

چپ و راست آراست از ترک و تیغ     چوآرایش گلبن از اشک میغ(۱۶۹, ۳۸)

**آراستن** (arastən) - döyüşə hazırlamaq

چواز هردوسولشگرآراستند     یلان سوبسومردمیخواستند(۱۶۹, ۴۰)

**آراسته** (araste) - gözəl, abad

نمودند کین مرز آراسته     زنی راست با آین بسی خواسته(۲۵۱, ۳۷)

**آراسته** (araste) - təmizlənmiş

شد از راه اوگرد برخاسته     که بی گرد به راه آراسته(۱۱۴, ۱۹)

**آراسته** (araste) - məzmunlu, gözəl yazılmış

یکی نامه در خواست آراسته     فروزانتر از ماه ناکاسته(۳۴۸, ۱۲۷)

**آراسته** (araste) - yığılmış, toplanmış

ازآن گنج آراسته داد بهر     بدادودهش گشت سالار دهر(۱۹۴, ۳۸)

**آراسته** (araste) - bəzənmiş

دوتاشدسهی سروآراسته     کدیورشدازسایه برخاسته(۲۷, ۲۸)

**آراسته** (araste) - hazır

دولشگربرابر شدآراسته     شد آزرمهاپاک بر خاسته(۸۱, ۴۴)

آراسته بودن (araste budən) - abad olmaq

نبودآنگه این شهرآراسته     دزی بود دروی بسی خواسته(۲۹۰, ۲۸)

آراسته شدن(araste şodən) - hazır olmaq, tamamlanmaq

چوشاهان نشستندبر بزم شاه     شد آراسته حلقهء بزمگاه(۴۵۷, ۱۱)

آراسته شدن (araste şodən) - bəzənmək



ببیروزی آن نقش درخواسته     چوپیروزه نقشی شدآراسته(۴۰۴, ۹)

آراسته گشتن (araste gəştən) - hazır olmaq

فروزنده مرد شد خواسته     کزو کارها گردآراسته(۱۹۳, ۳۳)

**آرام** (aram) - aram, rahatlıq

ملالت گرفت ازمن ایام را     بگنج ارم بردم آرام را(۳۵, ۶۷)

**آرامجوی** (aramcuy) - sülh istəyən

آرامجوی گشتن (aramcuy gəştən) - sülh istəmək

بمشکوی داراشوازمابگوی     که اینجابدان گشتم آرامجوی(۲۱۷, ۲۹)

**آرامش** (arameş) - sülh, rahatlıq

جهان را زدشمن تهی دیدجای     بارامش و رامش آورد رای(۴۵۵, ۵۸)

**آرام کردن** (aram kərdən) - rahatlanmaq, aram olmaq

جهانرا بفرمان خودرام کرد     درآن رام کردن کم آرام کرد(۲۳۳, ۱۰۳)

**آرام ماندن** (aram mandən) - sakit olmaq

بحرفی مسجل کنم نام او     که ماندرین جنبش آرام او(۴۴, ۵۷)

**آرامگاه** (aramqah) - istirahət yeri, düşərgə

بارامگاه آمدندازنبرد     زتن زخم شستندواز روی گرد(۱۷۳, ۹۵)

**آرامگاه** (aramqah) - yer, ölkə, diyar

سه چیزست کان در سه آرامگاه     بود هر سه کم عمروگردتباه(۳۴۰, ۱۴)

**آرامگاه** (aramqah) - sakit yer, rahat yer

زمین جزیره که آن موصلست     خوش آرامگاه خوش منزلست(۱۶۶, ۹۲)

**آرامگاه** (aramqah) - qəbr, aramgah

دگر نیزبینم که چون خفت شاه     درآن غارچون ساخت آرامگاه(۳۰۳, ۴۲)

آرامگاه ساختن (aramqah saxtən) - yerləşmək, oturmaq

بفرزانه گفتاکه برتخت شاه     نخواهم که سازدکس آرامگاه(۳۱۱, ۳۵)

**آرام گرفتن** (aram gereftən) - susmaq, məğlub olmaq

بزد بانگ بروی که ای زاغ پیر     عقاب جوان آمدآرام گیر(۹۷, ۱۹۷)

**آرام یافتن** (aram yaftən) - rahat olmaq

چو شاه جهان ره بدان جام یافت　　در آن تختگه لختی آرام یافت(۳۱۱, ۳۴)

**آرامگه** (aramgəh) - آرامگاه sözünün müxəffəfi-düşərgəh

جهاندار با فتح دمسازکرد　　شبانگه بارامگه بازگشت(۹۹, ۲۳۲)

آرامگه ساختن (aramgəh saxtən) - yer vermək, oturtmaq

چو نیکو نگه کرد بشناختش　　ز تخت خود آرامگه ساختش(۲۵۷, ۱۱۴)

**آرامیدن** (aramidən) - sakitləşmək

بیارام و تندی رهاکن ز دست　　که الماس ازارزیزیابدشکست (۱۶۳, ۴۸)

**آرایش** (arayeş) - bəzək

زرونق مبرنقش آرایشم　　نصیبی ده از گنج بخشایشم (۱۲, ۳۶)

آرایش دادن (arayeş dadən) - bəzəmək

گه ازمیوه آرایش خوان دهد　　گه از سایه آسایش جان دهد(۱۱۳, ۴)

آرایش کردن (arayeş kərdən) - bəzəmək

زهرگونه آرایش خوان کنند　　بسیج خورشهای الوان کنند(۲۶۶, ۲۴۱)

درآرایش آوردن (dər arayeş avərdən) - bəzəmək

بفرمود تا کارداران دهر　　در آرایش آرند بازاروشهر(۲۱۹, ۷۱)

**ارتنگ** (ərtəng) - şəkil

که چون کرده اند این دو صورت نگار　　دو ارتنگ رابریکی سان گزار(۳۷۷, ۲۷)

**ارجمند** (ərcomənd) - qiymətli

مرا باچنین گوهری ارجمند　　همی حاجت آید بگوهر پسند (۳۱, ۱۵)

آرجمند کردن (ərcomənd kərdən) - əzizləmək

دگر بندیان راز بیداد و بند　　بخلعت بر آراست کرد ارجمند (۴۶۰, ۶۴)

ارجمندگشتن (ərcomənd gəştən) - qiymətlənmək

بهمخوانی خود کنی سربلند　　که خوان گردداز نازکان ارجمند (۱۸۷, ۱۷۵)

**ارجمندي** (ərcoməndi) - şöhrət, hörmət

ارجمندی گرفتن (ərcoməndi gereftən) - şöhrətlənmək, hörmət qazanmaq



همان دولتی کارجمندی گرفت　　ز رای بلندان بلندی گرفت(۷۲, ۳۹)

**ارچه** (ərçe) - baxmayaraq ki, ...

چو کوسه همه پیرکودک سرشت　　بخوبی روندارچه هستندزشت(۸۰, ۲۲)

**آردن** (ardən) - آوردن felinin qısa forması

چنان برکشیدی وبستی نگار　　که به زان نیاردخردذرشمار(۴, ۱۴)

**آردیبهشت** (ordibeheşt) - ay adıdır

درآن بزم آراسته چون بهشت　　گل افشانتراز ماه اردیبهشت(۱۳۰, ۲۲)

**ارزان** (ərzan) - ucuz

نخرندکالا که پنهان بود　　که کالای ندنیده ارزان بود(۲۴, ۲۳)

**آرزو** (ar(e)zu) - arzu, istək

یکی آنک از گنج آراسته　　دهی آرزوهای ناخواسته(۵۰, ۶۶)

آرزو خواستن (ar(e)zu xastən) - arzulamaq

چه باید غروری بر آراستن　　نه بر جای حویش آرزوخواستن (۱۶۴, ۵۶)

آرزوخواه گشتن (ar(e)zuxah gəştən) - arzulamaq

دل شاه چوزان نکته آگاه گشت　　ازآن آرزوآرزوخواه گشت (۴۵۰, ۵۵۱)

آرزو داشتن (ar(e)zu daştən) - arzulamaq, istəmək

سه چیز آرزودارم اندرنهان　　بر آید باقبال شاه جهان (۱۸۷, ۱۶۹)

آرزو کردن (ar(e)zu kərdən) - arzulamaq

درآن آرزوگاه فرجاردیس　　نکرد آرزوبامعامل مکیس (۳۸۴, ۴۱)

**آرزوگاه** (ar(e)zuqah) - arzu yeri, yataq

درآن آرزوگاه بادورباش　　نکرندنجز بوسه چیزی تراش (۴۵۱, ۵۶۱)

**آرزوگاه** (ar(e)zuqah) - məclis

درآن آرزوگاه فرخاردیس　　نکردآرزوبامعامل مکیس (۳۸۴, ۴۱)

**آرزومند** (ar(e)zumənd) - arzulayan

شهی که آرزومندمعراج تست　　زمینبوس اودره التاج تست(۴۶, ۷)

آرزومند بودن (ar(e)zumənd budən) - arzulamaq

درآن تاختن کارزومند بود    رهش برگذرگاه دربند بود(۲۹۰, ۲۷)

**ارزیدن** (ərzidən) - layiq olmaq, dəymək

جهان غم نیرزدبشادی گرای    نه کزبهرغم کرده اندااین سرای(۴۶۲, ۸)

**ارزیز** (ərziz) - qalay, sink

بیارام و تندی رهاکن زدست    که الماس از ارزیزیابد شکست(۱۶۳, ۴۸)

**ارژنگ** (ərjəng) - Çin nəqqaşı Maninin emalatxanası

درارژنگ این نقش چینی پرند    قلم نیست بر مانی نقشبند(۵۴, ۱۵)

**ارژنگ** (ərjəng) - təsvir

یکی بود پیکردوارژنگ را    تفاوت نه هم نقش وهم رنگ را(۳۷۷, ۲۵)

**ارسطو** (ərəstu) - Ərəstun

نقوماخس آنکوخردمند بود    ارسطوی داناش فرزند بود(۷۰, ۱۵)

**آرش** (arəş) - Arəş (mifik ox atan)

مگر تیرش از جعبهء آرشست    که از نوک اوخاره با خارشست(۳۴۶, ۹۱)

**ارش** (əreş) - qol(bilək)

ارش کوته وزلف و گردن دراز    لبی چون شکرخال با اوبراز(۲۲۳, ۱۲۰)

**ارش**(əreş) - uzunluq ölçü vahidi

سنان کش یکی نیزهء سی ارش    باب جگریافته پرورش(۱۰۷, ۱۱)

**ارغنون** (ərğənun) - arqan

سرشک قدح نالهء ارغنون    روان کرده از رودها رود خون(۱۳۰, ۲۰)

**ارغنونزن** (ərğənunzən) - arqan çalan

زیونانیان ارغنونزن بسی    که بردندهوش ازهرکسی(۳۸۵, ۵۰)

**ارغوان** (ərğəvan) - qırmızı şərab

نشسته بکردارسروجوان    که گه لاله ریزدگهی ارغوان(۴۶۵, ۴۱)

**ارغوان** (ərğəvan) - qırmızı

بیا ساقی آن آب حیوان ارغوان    کزوپیرفرتوت گرددجوان(۳۳۹, ۱)

**ارغوان** (ərğəvan) - ərğəvan (gül növüdür)



سمن رادرودی ده از ارغوان    روان کن سوی گلبن آب روان(۶۱, ۱۳)

**ارغوان کشتن** (ərğəvan keştən) - ərğəvan əkmək (od yandırmaq)

مغی ارغوان کشته بر جای جو    بنفشه درووده بوقت درو(۲۷۷, ۳۱)

**ارغوانی** (ərğəvani) - al, qırmızı

بیا ساقی آن ارغوانی شراب    بمن ده که تامست گردم خراب(۴۰, ۱)

**ارک** (ərk) - Ərk( yer adı)

ستیزنده روسی زآلان وارک    شبیخونی آورد همچون تگرک(۳۹۴, ۲۴)

**ارم** (erəm) - İrəm (yer adı)

درآن موینه چون نظر کردشاه    بهار ارم دیددر بزمگاه(۴۵۸, ۲۷)

**ارمغان** (ərməğan) - töhfə, hədiyyə

بسی ارمغانی ز تاراج زنگ    بهر سوفرستاد بیوزن وسنگ(۱۱۶, ۴۹)

**ارمن** (ərmən) - Ərmən (Azərbaycanın bir hissəsi)

بارمن درآمد چودریای تند    صبا را شدازگرداوپای کند(۱۳۶, ۱۱۳)

**آرنده** (arənde) - elçi

بنیک وبدازرازهای نهفت    همان بود درنامه کارنده گفت(۳۲۰, ۴۵)

**ارنی** (ər ni) - yoxsa, əks təqdirdə

پذیرا شوارنی سپهربلند    بدولت گزایان درآرد گزند(۳۶۲, ۱۱۱)

**آز** (az) - hərislik

دوسوراخ چون روبه حیله ساز    یکی سوی شهوت یکی سوی آز(۸۴, ۱۰)

**از** (əz) - önqoşma, çıxışlıq halı bildirir

چو شه دیدکان یادگارکیان    خبر داردازکارسودوزیان(۱۹۸, ۱۰۶)

**از** (əz) - yerlik halı bildirir

چهل روزخودراگرفتم زمام    کادیم ازچهل روزگرددتمام(۳۶, ۸۱)

**از** (əz) - yönlük halı bildirir

سپاس ازخداوند گیتی پناه    که بیشست ازین قصه انصاف شاه (۵۱, ۸)

**از** (əz) - təsirlik halı bildirir

